AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ • 1921

QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Mart 2019 № 03 (1100)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## AMEA-nın akademik Yusif Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun 90 illik yubileyinin qeyd edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2019-cu ildə AMEA-nın akademik Yusif Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun yaradılmasının 90 illiyi tamam olur.

"Azneft" İstehsalat Birliyinin Mərkəzi Kimya Laboratoriyası bazasında 1929-cu ildə ilk Azərbaycan Neft Tədqiqat İnstitutu kimi fəaliyyətə başlayan, 1959-cu ildən isə Azərbaycan Elmlər Akademiyasının Neft-Kimya Prosesləri İnstitutu adlandırılan bu mötəbər elmi mərkəz Azərbaycanda neft emalı və neft kimyası sahəsində fundamental tədqiqatları ilə tanınmış və ötən müddət ərzində mühüm nailiyyətlər qazanmışdır. İkinci Dünya müharibəsində qələbənin əldə edilməsində Bakı neftinin əhəmiyyətli rol oynaması, eyni zamanda, institut alimlərinin təqdirəlayiq əməyi ilə bağlıdır. İnstitutda işlənib hazırlanan yeni üsul və texnologiyalar, aparılan yüksək səviyyəli tədqiqatların nəticələri və ali dövlət mükafatlarına layiq görülən ixtiralar sənayedə özünün geniş tətbiqini tapmışdır. İnstitut əməkdaşlarının müvafiq elmi istiqamətlər üzrə tədqiqatları xarici ölkələrin ən sanballı elmi nəşrlərində əks etdirilmişdir. İnstitutun hazırladığı yüksəkixtisaslı kadrlar respublikada və onun hüdudlarından kənarda bu gün də uğurla çalışmaqdadırlar.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, AMEA-nın akademik Yusif Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun ölkədə neft-kimya elmlərinin və neft sənayesinin inkişafında müstəsna xidmətlərini nəzərə alaraq qərara alıram:

1. Azərbaycan Milli Elmlər Akademiyası AMEA-nın akademik Yusif Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun 90 illik yubileyinə həsr olunmuş tədbirlər planı hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 11 mart 2019-cu il*

## 1 Mart - Ümumdünya Mülki Müdafiə Gününə həsr olunmuş tədbir

Martın 1-də Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyinin (FHN) əməkdaşlarının iştirakı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Ümumdünya Mülki Müdafiə Gününə həsr olunmuş "Uşaqların təhlükəsizliyi, bizim məsuliyyətimiz" mövzusunda tədbir keçirilib. Qeyd edək ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərov universitetin 2019-cu il üçün mülki müdafiə üzrə hazırlıq planına əsasən fevralın 6-da bu tədbirin yüksək səviyyədə keçirilməsi məqsədilə müvafiq əmr imzalayıb. Həmin əmrə əsasən universitetdə 5 nəfərdən ibarət komissiya yaradılıb. Tədbirdə ADPU-nun rəhbərliyi, Səbail Rayon İcra Hakimiyyətinin (RİH) məsul şəxsləri, FHN-nin Bakı Regional Mərkəzinin, nazirliyin Dövlət Yanğından Mühafizə İdarəsinin Səbail rayon hissəsinin, Səbail Rayon Təcili və Təxirəsalınmaz Tibbi Yardım Stansiyasının, bələdiyyələrin əməkdaşları, rayon veteranlar təşkilatlarının, Azərbaycan Qızıl Aypara Cəmiyyətinin rayon bölməsinin nümayəndələri, universitetin müəllim-texniki heyəti, hərbiləşdirilməmiş mülki müdafiə qüvvələrinin komandir-rəis və şəxsi heyəti, tələbələri iştirak ediblər. Universitetin həyətində başlayan tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.




Tədbiri giriş sözü ilə açan Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev qeyd edib ki, 1 Mart-Ümumdünya Mülki Müdafiə Günü 1972-ci ildə Beynəlxalq Mülki Müdafiə Təşkilatının yaradılması şərəfinə qeyd edilən xüsusi gündür. Bu gün Beynəlxalq Mülki Müdafiə Təşkilatının qərarı ilə elan olunub və hər il bütün qitələrdə kütləvi humanitar tədbir kimi qeyd edilir. Azərbaycan 1993-cü ildən bu nüfuzlu beynəlxalq təşkilatın üzvüdür. Müasir dövrümüzdə vətəndaşların mühafizəsini təşkil etmək, fövqəladə hallardan mühafizə sahəsində əhalinin hazırlığını təmin etmək mülki müdafiə təşkilatları qarşısında dayanan əsas vəzifələrdən biridir.



Tədbirdə çıxış edən Səbail RİH-in şöbə müdiri Anar Axundzadə bildirib ki, Ümumdünya Mülki Müdafiə Günü münasibətilə rayon icra hakimiyyəti tərəfindən müvafiq sərəncam verilib və tədbirlər keçirilir.

Səbail rayonu üzrə fövqəladə hallar və mülki müdafiə şöbəsinin rəisi, polkovnik-leytenant Nazir Əkbərov tədbirin keçirilməsinin əhəmiyyətindən danışaraq bildirib ki, əsas məqsəd tələbələri maarifləndirmək, baş verə biləcək təbii fəlakət, yanğın və qəza hadisələri zamanı düzgün təxliyə olunmasının öyrədilməsidir.

Çıxışlardan sonra universitetin həyətində süni yanğın hadisəsi təşkil olunub və həyəcan siqnalı verilib. Dörd dəqiqə ərzində tələbə və müəllim heyəti universitetin binasından təxliyə olunub. Təxliyə olunan andan şərti xilasetmə əməliyyatına başlanılıb. Əvvəlcə "112" qaynar telefon xəttinə məlumat verilib. Tələbələrin iştirakı ilə hadisə zamanı universitetin binasında qalan yaralılar həyətə çıxarılıb, onlara ilkin tibbi yardım göstərilib və təcili tibbi yardım maşınları ilə xəstəxanalara aparılıblar. Ətrafdakı radiasiyanın müəyyən olunması, əleyhqaz və digər vasitələrdən istifadə qaydaları izah edilib. Təlimlər çərçivəsində xilasedici, yanğınsöndürmə, radiasiya əleyhinə və digər mühafizə vasitələrinə, FHN-nin xilasedicilərinin xüsusi texnikasına və alətlərinə baxış keçirilib.

Sonra tədbir universitetin Heydər Əliyev məktəbinin lektoriyasında davam edib. Tələbələr üçün əyani vəsaitlər və videofilm nümayiş etdirilib.

**Mənsur İbrahimli**

## "Xüsusi xidmət orqanlarının gənclər arasında fəaliyyəti, Heydər Əliyevin xüsusi xidmət orqanlarında fəaliyyəti və xüsusi xidmət orqanları" mövzusunda tədbir

Martın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikası Dövlət Təhlükəsizliyi Xidmətinin (DTX) 100 illik yubileyi münasibətilə "Xüsusi xidmət orqanlarının gənclər arasında fəaliyyəti, Heydər Əliyevin xüsusi xidmət orqanlarında fəaliyyəti və xüsusi xidmət orqanları" mövzusunda tədbir keçirilib. Tədbirdə universitetin rəhbərliyi, professor-müəllim və tələbə heyəti, DTX-nın əməkdaşları iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev qonaqları və tədbir iştirakçılarını salamlayaraq bildirib ki, bu gün DTX-nın və ADPU-nun rəhbərliyinin təşəbbüsü ilə universitetdə maraqlı görüş keçirilir. Tələbələr yüksək səviyyəli mütəxəssis kimi yetişməklə yanaşı, həm də sağlam düşüncəyə malik olmalı, əsl vətəndaş kimi formalaşmalıdırlar. Belə görüşlər gənclərin ölkəmizdə və dünyada gedən ictimai-siyasi proseslərin mahiyyətini dərindən anlamalarına və düzgün istiqamət götürmələrinə səmərəli təsir göstərir. Bu baxımdan, belə görüşlərə həmişə böyük ehtiyac var və bu tip tədbirlərin davamlı keçirilməsi məqsədəuyğundur.

(Davamı 2-ci səhifədə)

# “Xüsusi xidmət orqanlarının gənclər arasında fəaliyyəti, Heydər Əliyevin xüsusi xidmət orqanlarında fəaliyyəti və xüsusi xidmət orqanları” mövzusunda tədbir

(Əvvəli 1-ci səhifədə)

DTX-nın əməkdaşı Fəxrəddin Quliyev tədbirin təşkil olunmasına görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, müəllim və tələbələrə uğurlar arzulayıb. Qeyd edib ki, daxil olan əməliyyat məlumatlarının təhlili göstərir ki, xarici xüsusi xidmət orqanları, terrorçu təşkilatlar öz təxribat və kəşfiyyat-pozuculuq fəaliyyətlərinin həyata keçirilməsində gənclərdən daha çox istifadə etməyə çalışırlar. DTX-nın əməkdaşlarının ali təhsil müəssisələrində tələbə-gənclərlə keçirdikləri görüşlər profilaktik xarakter daşıyır və maarifləndirmək məqsədinə xidmət edir. Xalqımızın milli maraqlarının və milli təhlükəsizliyin təmin edilməsi həyati əhəmiyyət kəsb edən məsələdir.

Maraqlı və məzmunlu çıxışında F.Quliyev vurğulayıb ki, xalqımızın dahi oğlu, ümummilli liderimiz Heydər Əliyev 25 il xüsusi xidmət orqanlarında xidmət edib və bu sahədə general rütbəsinə yüksələn ilk azərbaycanlıdır. Məhz ulu öndər Heydər Əliyev ölkəmizin təhlükəsizlik orqanlarına




rəhbərlik edərkən bu strukturda milliləşdirilmə prosesini həyata keçirib və gələcək müstəqil Azərbaycanın milli kadr potensialının formalaşmasında böyük xidmətlər göstərib. Dahi öndər Heydər Əliyev Azərbaycanın milli ruhlu, vətənpərvər ziyalılarını təhlükələrdən qoruyub, onları təqiblərdən və həbsdən xilas edib.

Ulu Öndərin müdrik siyasi kursunu inamla və uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev xalqımızın ən



böyük nailiyyəti olan dövlət müstəqilliyinin qorunub saxlanılması və daha da möhkəmləndirilməsi sahəsində üzərinə mühüm vəzifələr düşən Dövlət Təhlükəsizliyi Xidmətinin şəxsi heyətinin saflığına, Vətənə, xalqa və dövlətə sədaqətinə, eyni zamanda peşə, fiziki və döyüş hazırlığına, fəaliyyətinin səmərəliliyinin artırılmasına xüsusi önəm verir. DTX-nın fəaliyyəti insan və vətəndaş hüquq və azadlıqlarına riayət olunması, humanizm, dövlət və cəmiyyət qarşısında cavabdehlik prinsiplərinə əməl olunması ilə həyata keçirilir. Yüksək peşəkarlıq və intellektual səviyyə, ciddi xidmət və icra intizamı başlıca meyarlardır. Məhz buna görə hazırda DTX-nın fəaliyyəti keyfiyyətcə yeni mərhələyə daxil olub.

Tədbirdə tələbələri maraqlandıran suallar DTX-nın əməkdaşları tərəfindən cavablandırılıb.

**Orxan Abdullayev**

# Elmi Şuranın iclası

Martın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə “ADPU-da payız semestrinin imtahan sessiyasının nəticələri və yaz semestrində qarşıda duran vəzifələr haqqında hesabat” və cari məsələlər daxildir.

İclasda öncə rektor Cəfər Cəfərov Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının müvafiq qərarı ilə Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının müdiri Naibə Əhmədovaya dosent attestatı, həmçinin universitetin ictimai-siyasi həyatında fəal iştirak etməsinə görə və 80 illik yubileyi münasibətilə Filologiya fakültəsinin Azərbaycan və dünya ədəbiyyatı kafedrasının professoru Himalay Qasımova, universitetin ictimai-siyasi həyatında fəal iştirak etməsinə görə və 65 illik yubileyi münasibətilə Hərbi səfərbərlik və xüsusi şöbənin rəisi Telman Budaqova fəxri fərmanlar təqdim edib, onlara uğurlar arzulayıb.

Professor H.Qasımov, dosent N.Əhmədova və T.Budaqov göstərilən diqqətə görə universitetin rəhbərliyinə təşəkkür ediblər.

Rektor çıxışında qeyd edib ki, payız semestrinin imtahan sessiyası mütəşəkkil keçirilib, aşkarlıq, şəffaflıq və obyektivlik tam təmin edilib. Bütövlükdə sessiya uğurla başa çatıb. Həyata keçirilən məqsədyönlü tədbirlər nəticəsində cəmiyyətdə ADPU-ya baxış dəyişib. Həm cəmiyyət, həm də rəhbərlik ADPU-da həyata keçirilən səmərəli fəaliyyətə rəğbətlə yanaşır. Bu, bütün kollektivimizin uğurudur. ADPU dünyanın aparıcı universitetləri ilə əlaqələri və əməkdaşlığı genişləndirir. Mən Təhsil Nazirliyinin xətti ilə bu yaxınlarda Amerika Birləşmiş Ştatlarında (ABŞ) səfərdə olmuş, müxtəlif görüşlərdə iştirak etmişəm. Hazırda ABŞ-ın Corc Vaşinqton Universiteti ilə danışıqlar aparılır. Bu əlaqələr bizim üçün yeni imkanlar, yeni perspektivlər açacaqdır.

Ölkədə aparılan islahatların miqyası genişlənir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin son vaxtlar imzaladığı sərəncamlar, fərmanlar, qəbul etdiyi qərarlar bizim qarşımızda yeni mühüm və məsuliyyətli vəzifələr qoyur. Qarşımızda dayanan əsas vəzifələrdən biri təhsilin beynəlmiləlləşdirilməsi, tədris planlarının beynəlxalq standartlara uyğun yenidən işlənilməsi, təhsilin keyfiyyətinin yüksəldilməsidir. Biz filiallar və kolleclə birlikdə vahid komanda halında fəaliyyət göstərməli, öz işimizi daha səmərəli qurmalıyıq.

“ADPU-da payız semestrinin imtahan sessiyasının nəticələri və yaz semestrində qarşıda duran vəzifələr haqqında hesabat” məruzəsi ilə Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov çıxış edib. Prorektor E.Aslanov bildirib ki, payız semestrinin imtahan sessiyasını keçirmək üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılıb. Universitetdə imtahan sessiyasına hazırlıq və imtahanların keçirilməsi üçün 26.12.2018-ci il tarixli 3/183 nömrəli əmr verilib. İmtahanlar yanvarın 3-dən fevralın 5-dək tərtib olunmuş cədvəl üzrə keçirilib. Universitetdə bütün aralıq qiymətləndirmələr və semestr imtahanları Tədris Departamentinin İmtahan və monitorinq şöbəsi tərəfindən həyata keçirilib və vahid mərkəzdən idarə olunub. Semestr imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədilə Tədris Departamentin ümumi təşkilatçılığı və koordinatorluğu ilə 9 nəfərdən ibarət Apelyasiya Komissiyası, 8 nəfərdən ibarət İmtahan Qərargahı, 45 nəfərdən ibarət təşkilatçı, o cümlədən 125 nəfər nəzarətçidən ibarət İmtahan İdarəetmə Qrupu yaradılıb və imtahanların təşkili ilə əlaqədar bütün funksiyaların icra edilməsi bu qrupa həvalə edilib. İmtahan sessiyasının təşkilinə və keçirilməsinə nəzarət, aşkarlıq və şəffaflığın daha da artırılması məqsədilə 20 nəfərdən ibarət İctimai Şura yaradılıb. İctimai Şurada ADPU-nun nümayəndələri ilə yanaşı, kütləvi informasiya vasitələrinin, qeyri-hökumət təşkilatlarının təmsilçiləri, tanınmış və nüfuzlu təhsil ekspertləri, həmçinin Azərbaycan Respublikasının Prezidenti yanında Kütləvi İnformasiya Vasitələrinin İnkişafına Dövlət Dəstəyi Fondunun və Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının üzvləri yer alıblar.



Payız semestrinin imtahan sessiyasında İmtahan Qərargahına ümumilikdə 303 müraciət edilib. Həmin müraciətlərdən 293-ü yazılı, 10-u isə test üsulu ilə verilən imtahanlardan olub. İmtahan Qərargahına daxil olan müraciətlər qaydalara uyğun olaraq çevik araşdırılıb və müvafiq qərarlar qəbul edilib. Apelyasiya Komissiyasına 2517 müraciət edilib. Müraciət edən 1613 nəfər tələbənin aldığı qiymət qüvvədə saxlanılıb, 904 nəfər tələbənin müraciəti isə müsbət həll edilib.

Prorektor E.Aslanovun hesabat məruzəsində filiallarda və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində payız semestrinin imtahan sessiyasının nəticələri öz əksini tapıb. Qeyd edib ki, bütövlükdə imtahan prosesində mütəşəkkillik, aşkarlıq və şəffaflıq artıb.

Prorektor E.Aslanov çıxışının sonunda tədris prosesinin və imtahan sessiyasının keçirilməsinin daha da təkmilləşdirilməsi ilə bağlı təkliflərlə çıxış edib və qarşıda duran vəzifələri diqqətə çatdırıb.

Elmi Şura dosent E. Aslanovun hesabatını qəbul edib.

İmtahan Qərargahının rəhbəri, dosent Asif Axundov, Apelyasiya Komissiyasının sədri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov qərargaha və komissiyaya daxil olan müraciətlərin məzmun və mahiyyəti, onların araşdırılması və görülən tədbirlər barədə ətraflı məlumat veriblər. Dosent A.Axundov və R.Sadıqov imtahan yazı işlərinin qiymətləndirilməsi zamanı şəffaflığın və obyektivliyin daha da artırılması üçün təkliflər irəli sürüblər.

Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, professor Vəli Əliyev, professor Nailə Verdizadə, professor Bəhram Əliyev, dosent İsrayıl İsgəndərov, dosent Arzu Daşdəmirov, dosent Laçın Həsənova, dosent Şahin Pənahov, dosent Naibə Əhmədova Elmi Şurada aparılan müzakirələrdə fəal iştirak ediblər.

Cari məsələlərin müzakirəsi zamanı Elm və innovasiyalar üzrə prorektor , professor Asəf Zamanov Elmi Tədqiqatlar Mərkəzinin yaradılması, Tədris işləri üzrə prorektor, dosent E.Aslanov ADPU-nun filiallarının elmi şuralarının tərkibi və Keyfiyyətin təminatı şöbəsinin Əsasnaməsi haqqında, Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə PETRA layihəsi çərçivəsində “Öyrətmə və öyrənmə qaydaları” adlı sənədin hazırlanması məqsədilə işçi qrupun yaradılması və qaydaların hazırlanması haqqında, Elmi katib, dosent İradə Qasımova elmlər doktoru və fəlsəfə doktoru proqramları üzrə dissertasiya mövzuları və elmi rəhbərlər, Kimya və biologiya fakültəsinin Biologiya və onun tədrisi metodikası kafedrasının dosenti Elnurə Səfərovaya dosent elmi adının verilməsi üçün Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının qarşısında vəsatət qaldırılması barədə məlumat veriblər.

Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

**Mahirə Mustafayeva**

# İbtidai təhsil fakültəsində ingilis dili fənninin tədrisi vəziyyəti müzakirə edilib

İbtidai təhsil fakültəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasında 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələri və qarşıda duran vəzifələrlə bağlı universitetin rektoru, professor Cəfər Cəfərovun, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanovun, Apelyasiya Komissiyasının sədri Rəşad Sadıqovun və İmtahan Qərargahının rəhbəri, dosent Asif Axundovun fakültə ilə bağlı təklif və tövsiyələri kafedra müdirlərinin və müəllimlərinin iştirakı ilə geniş müzakirə olunur. Martın 13-də Filologiya fakültəsinin İngilis dili kafedrasının müdiri, dosent Gülçöhrə Alıyevanın və fakültədə dərs deyən ingilis dili müəllimlərinin iştirakı ilə “İbtidai təhsil fakültəsində ingilis dili fənninin tədrisi vəziyyəti” müzakirə olunub.



Fakültənin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov məlumat verib ki, payız semestrinin imtahan sessiyasında I tədris ili üzrə 298 nəfər, II tədris ili üzrə 275 nəfər, III tədris ili üzrə 304 nəfər, IV-V-VI tədris illəri üzrə 9 nəfər tələbə ingilis dili fənnindən imtahan veriblər. İmtahanın nəticələri digər fənlərlə müqayisədə qənaətbəxş olub. İştirak edən tələbələrdən yalnız 3 nəfərin akademik borcu qalıb. Fakültədə ingilis dilinin 6 semestr intensiv şəkildə tədris edildiyini qeyd edən professor F.Rüstəmov tələbələrin dil öyrənmə bacarığından, müəllimlərin ciddi və məsuliyyətli olmalarından, ingilis dilinin tədrisinin praktik istiqamətinin daha da gücləndirilməsi məqsədilə görüləcək işlərdən danışıb.

İngilis dili kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva işgüzar müzakirə üçün təşəkkürünü bildirib və ingilis dili fənninin keyfiyyətinin yüksəldilməsi, tələbələrin dil öyrənmə bacarığının artırılması üçün görüləcək işlərdən danışıb. Fakültədə ingilis dilində tədbirlərin keçirilməsi, Taləhə Əhmədova tərəfindən tələbələr üçün 2 ay yarımlıq “Speaking through listening” (Dinləmə vasitəsilə danışıq”) dil dərslərinin təşkil edilməsi planlaşdırılıb.

# Professor Kamran Əliyevin ustad dərsi

Martın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Elm günü" ilə bağlı keçirilən tədbirlər çərçivəsində görkəmli ədəbiyyatşünas alim, tənqidçi, filologiya elmləri doktoru, Əməkdar elm xadimi, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Folklor İnstitutunun Folklor və yazılı ədəbiyyat şöbəsinin müdiri, AMEA-nın müxbir üzvü, professor Kamran Əliyevin Filologiya fakültəsinin professor-müəllim heyəti və tələbələri üçün "Açıq kitab-Dədə Qorqud" mövzusunda ustad dərsi keçirilib.

Tədbiri Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova açaraq bildirib ki, Kamran Əliyev 1953-cü ilin mart ayının 5-də Naxçıvan Muxtar Respublikasının Şərur rayonunun Diyadin kəndində anadan olub. O, 1969-cu ildə orta təhsilini başa vurduqdan sonra həmin il Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) Filologiya fakültəsinə qəbul olunub. Universiteti fərqlənmə diplomu ilə bitirən K.Əliyev 1974-1976-cı illərdə Şərur rayonunun Xanlıqlar kənd orta məktəbində Azərbaycan dili və ədəbiyyatı müəllimi işləyib. O, 1976-1979-cu illərdə AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun aspiranturasında təhsilini davam etdirib, həmin institutda kiçik elmi işçi, baş elmi işçi və aparıcı elmi işçi vəzifələrində çalışıb. 1993-cü ildən Naxçıvan Universitetində müəllim, 1994-2001-ci illərdə həmin universitetdə Azərbaycan dili və ədəbiyyatı kafedrasının müdiri, eləcə də tədris işləri üzrə prorektor işləyib.



Alim 2002-ci ildən AMEA-nın Folklor İnstitutunun aparıcı elmi işçisi, 2012-ci ildən isə Folklor və yazılı ədəbiyyat şöbəsinin müdiri vəzifəsində çalışır.

O, 2015-ci ildə Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə "Əməkdar elm xadimi" fəxri adına layiq görülüb. 2017-ci ildə isə AMEA-nın müxbir üzvü seçilib. Alim 20 kitabın, o cümlədən 12 monoqrafiya, 300-ə yaxın elmi məqalənin müəllifidir. Onun rəhbərliyi ilə 10 namizədlik dissertasiyası müdafiə edilib.

Professor K.Əliyev həmçinin 16 doktorluq və 49 namizədlik dissertasiyasının rəsmi opponenti olub.

Professor K.Əliyev 1200 illik tarixi olan "Kitabi-Dədə Qorqud" dastanlarının tədqiqi ilə 10 ildən artıq iş apardığını, dastanın bizə şifahi və ya yazılı şəkildə çatması məsələsinə hələ də tam aydınlıq gəlmədiyini, onu şifahi mətn kimi sübut etməyə çalışmasından söhbət açıb. Məsələ ilə bağlı bir sıra inandırıcı faktlardan söhbət açıb, dastanın ayrı-ayrı boylarından, bu boylarda rastlaşılan bayatılardan, dastanda işlədilən ifadələrdən elmi-nəzəri açıqlamalar verib. Mətnin möhtəşəmliyindən danışan alim orada rastlaşılan rəqəmlərin dili ilə xalqımızın və dastanın tarixinə dair bir sıra gizli məqamlara aydınlıq gətirib. O, eposdakı sirli mənaları, əsərin dərinliklərində rastlaşılan simvolları elmi faktlarla mənalandırıb. Professor K.Əliyevin eposun dili və onun lüğət tərkibi haqqında söylədiyi elmi-nəzəri fikirlər də tədbir iştirakçılarının böyük marağına səbəb olub.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bildirib ki, professor K.Əliyev müasir ədəbiyyatşünaslıq elminin tərəqqisində, ədəbi tənqidimizin inkişafında böyük xidmətləri olan çoxcəhətli bir istedad sahibidir. O, yaradıcılığının bütün dövrlərində öz sözünü demişdir. Ədəbiyyat tarixi və ədəbiyyat nəzəriyyəsi sahəsində ardıcıl və səmərəli işləmiş, romantik üslubun tədqiq edilib öyrənilməsində, klassik irsimizin, folklorumuzun mühüm ədəbi - ictimai problemlərinin işıqlandılmasında böyük əmək sərf etmişdir. Onun qələmindən çıxmış sanballı tədqiqat əsərləri bir daha göstərir ki, K.Əliyev maraq dairəsi, tədqiqat imkanları geniş olan alimlərdəndir. Bu gün "Kitabi-Dədə Qorqud" dastanı haqqında söylədikləri onun tükənməz enerji ilə çalışdığını sübuta yetirir, dastanla bağlı gəldiyi qənaətlər olduqca inandırıcı görünür. Bu görüşdə mən belə qənaətə gəldim ki, Kamran müəllim tələbələrimizə tədqiqat xarakterli çox faydalı məlumatlar verdi, yollar göstərdi, düşüncəmizi yeni faktlarla təzələdi.

Tədbirin sonunda professor K.Əliyev tələbələrin suallarını cavablandırıb, xatirə şəkli çəkdirilib.

**Günay Bağırlı**

# "Türkologiyamızın Afad Qurbanovu" kitabının təqdimat mərasimi

Martın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının sabiq müdiri, professor Əzizxan Tanrıverdinin görkəmli dilçi-alim, türkoloq, Onomastika elmi məktəbinin banisi, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, Əməkdar elm xadimi, Dövlət Mükafatı laureatı, ictimai-siyasi xadim, latın qrafikalı Azərbaycan əlifbasının müəllifi, professor Afad Qurbanovun 90 illik yubileyi münasibətilə hazırladığı "Türkologiyamızın Afad Qurbanovu" kitabının təqdimat mərasimi keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, ölkəmizin tanınmış, nüfuzlu ziyalıları, fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələr iştirak ediblər. Kitabın redaktoru professor Fikrət Xalıqov, rəyçiləri filologiya üzrə elmlər doktoru Məhərrəm Hüseynov, filologiya üzrə elmlər doktoru Kamil Bəşirov, filologiya üzrə fəlsəfə doktoru Vaqif



İsrafilov və İlham Abbasovdur. "Ön söz"ün müəllifi filologiya üzrə fəlsəfə doktoru Arif Kazımovdur. Qeyd edək ki, kitabda Afad Qurbanov bənzərsiz insan, nüfuzlu alim, bacarıqlı elm və təhsil təşkilatçısı kimi xatirələr müstəvisində səciyyələndirilir, onun elmi-pedaqoji fəaliyyəti daha çox haqqında yazılmış məqalələrə istinad olunmaqla izah edilir, dilçiliyə dair əsərləri müxtəlif bucaqlar altında təhlil süzgəcindən keçirilir. Eyni zamanda Afad Qurbanova həsr edilmiş şeirlərin hər birinə ədəbi tənqid müstəvisində münasibət bildirilir. Tədbirdən öncə iştirakçılar Afad Qurbanovun əsərlərindən ibarət sərgi ilə tanış olublar.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov universitetin rektoru, professor Cəfər Cəfərovun adından tədbir iştirakçılarını salamlayıb və qeyd edib ki, bu gün universitetimizin həyatında gözəl və əlamətdar bir gündür. Biz bu gün professor Əzizxan Tanrıverdinin müəllifi olduğu "Türkologiyamızın Afad Qurbanovu" kitabının təqdimat mərasimini keçiririk. Tədbirdə böyük dilçi-alim , professor Afad Qurbanovun elmi yaradıcılığı və elmi-təşkilati fəaliyyəti, pedaqoji və elmi-pedaqoji kadrların hazırlanması sahəsindəki xidmətləri haqqında çıxışlar ediləcək. Professor Afad Qurbanov həmişə xalqına, millətinə, Vətəninə vicdanla, şərəflə xidmət edib.



Çıxışında professor Afad Qurbanovun həyat və fəaliyyəti haqqında geniş məlumat verən professor Asəf Zamanov bildirib ki, Afad Qurbanov 1929-cu il yanvar ayının 10-da Qərbi Azərbaycanın Qızıl Şəfəq kəndində anadan olub. Uşaqlığı, ilk təhsil illəri də burada keçib. O, ilk illər məktəb direktoru vəzifəsində çalışıb. 1948-ci ildə ADPU-ya qəbul olunub. Aspirantlıqdan AMEA-nın müxbir üzvlüyünə qədər şərəfli bir tədqiqatçı yolu keçən A.Qurbanov 1962-ci ildə professor Əbdüləzəl Dəmirçizadənin rəhbərliyi ilə "Səməd Vurğunun "Vaqif pyesinin dili və üslubu" mövzusunda namizədlik, 1968-ci ildə isə "Müasir Azərbaycan ədəbi dili" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Azərbaycan dilçiliyində fonetika Əbdüləzəl Dəmirçizadə və Ağamusa Axundovun, leksikologiya Səlim Cəfərovun, dialektologiya Məmmədağa Şirəliyevin, morfologiya Muxtar Hüseynzadənin, sintaksis Əlövsət Abdullayevin, dil tarixi Hadi Mirzəzadə, Ə.Dəmirçizadə və Tofiq Hacıyevin, morfologiya Firudin Cəlilovun, onomalogiya isə A.Qurbanovun adı ilə bağlıdır. Onun onomalogiyaya dair 100-ə qədər məqaləsi, "Azərbaycan onomastikası" (1986), "Azərbaycan onomalogiyası məsələləri" (1986), "Poetik onomastika" (1988), "Azərbaycan dilinin onomalogiyası" (1988) kimi sanballı monoqrafiyaları çap olunub. Bu əsərlərdə onomastik vahidlərin tədqiqi tarixi, onomastik mənbələr, onomalogiyanın elmi-nəzəri məsələləri kompleks və sistemli şəkildə tədqiq edilib. Azərbaycan dilçiliyi tarixində ilk dəfə olaraq antroponimlərin inkişafı dövrlərini müəyyənləşdirən, hər bir dövrün səciyyəvi cəhətlərini konkret dil faktları ilə əsaslandıran da A.Qurbanovdur. Elmi yaradıcılığa "Şagirdlərin yazılı və şifahi nitqlərindəki yerli şivə və qalıqlarına qarşı mübarizə" (1956) adlı məqalə ilə başlayan yorulmaz tədqiqatçı Azərbaycanda və bütün türk dünyasında "Dilçiliyin sistemi" (1976), "Dilçiliyin tarixi" (1976), "Müasir Azərbaycan ədəbi dili" (1967, 1985), "Bədii mətnin linqvistik təhlili" (1986), "Ümumi dilçilik", I-II cildlər (1989-1993), "Dünyanın dil ailələri" (1994) və sair kimi sanballı əsərləri ilə məşhurdur. Azərbaycan ədəbi dilinin fonetika, qrafika, leksikologiya, semasiologiya, frazeologiya və digər sahələri A.Qurbanovun 1967-ci ildə çap etdirdiyi "Müasir Azərbaycan ədəbi dili" kitabında sistemli şəkildə, həm də sinxronik prizmadan tədqiq edilib. Əsər barədə akademik A.N.Kononovun fikri maraqlıdır: "A.M.Qurbanovun kitabı yalnız Azərbaycan dili materiallarını deyil, həm də başqa türk dillərinin materi-



allarını əhatə edən mövzuları işıqlandırır".

A.Qurbanov 1950-ci illərdən etibarən ADPU-da Filologiya fakültəsinin dekan müavini, dekanı, Azərbaycan dilçiliyi kafedrasının müdiri vəzifələrində işləyib. 1981-1989-cu illərdə ADPU-nun rektoru vəzifəsində çalışıb. 1981-1983-cü illərdə ADPU-da filologiya və pedaqogika elmləri üzrə Müdafiə Şurasının sədri olub. ADPU-ya rəhbərlik etdiyi dövrdə universitet tamamilə yenidən qurulmuş, tədris yüksək səviyyəyə qaldırılmış, yeni kafedralar yaradılmış, sədri olduğu dissertasiya şuralarının işi keyfiyyətcə yenilənmişdir. 1990-1995-ci illərdə Milli Məclisin deputatı olmuş A.Qurbanov əlifba islahatının təşkilatçılarındandır. A.Qurbanovun XX əsrin 90-cı illərində Azərbaycan Əlifba Komissiyasının sədri kimi ölkəmizdə əlifba islahatının aparılmasında və bu gün istifadə etdiyimiz latın qrafikalı Azərbaycan əlifbasının hazırlanmasında böyük xidmətləri olub. Həmin dövrdə latın qrafikalı Azərbaycan əlifbasına keçməyin zəruriliyini elmi faktlarla əsaslandıran ilk alim məhz A.Qurbanov olub. Sonradan televiziya və mətbuat vasitəsi ilə müasir əlifbamızın layihəsi ictimaiyyətə çatdırılıb, geniş müzakirə olunub və qəbul edilib. XX əsrin 20-ci illərində Azərbaycanda istifadə olunan latın qrafikalı əlifba böyük mütəfəkkir M.F.Axundzadənin ideyası əsasında yaradıldığı halda, hazırda istifadə etdiyimiz latın qrafikalı Azərbaycan əlifbası A.Qurbanovun adı ilə bağlıdır. Ümumxalq sərvətimiz olan bugünkü əlifba bu yorulmaz insanın, xalqını dərindən sevən fəal vətəndaşın, dilçilik elmimizin korifeyi A.Qurbanovun elmi və ictimai fəaliyyətinin bəhrəsi kimi Azərbaycan xalqına ən böyük töhfələrindən biridir.

Professor A.Qurbanovun əsərləri Almaniya, Rusiya, İran, Türkiyə, Qazaxıstan, Türkmənistan, Özbəkistan və digər ölkələrdə yayılıb. Məşhur dilçi-alim son 50 ildə dünyanın bir sıra böyük şəhərlərində dilçiliyə, xüsusilə türkologiyaya aid keçirilən konfransların əksəriyyətində aktual və orijinal məruzələrlə çıxış edib.

O, gözəl ailə başçısı, qayğıkeş ata olub. Övladlarını həqiqi vətəndaş, yüksək səviyyəli elmi mütəxəssislər kimi yetişdirib.

Professor A.Qurbanov 2009-cu il sentyabr ayının 26-da vəfat edib. A.Qurbanovun xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır.

Tədbirdə professor A.Qurbanovla bağlı sənədli film nümayiş etdirilib.

Tədbirdə çıxış edən Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova, Müasir Azərbaycan dili kafedrasının müdiri, professor Buludxan Xəlilov, Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyev, Azərbaycan Dillər Universitetinin Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Adil Babayev, AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun Tətbiqi dilçilik şöbəsinin müdiri, professor İsmayıl Məmmədli, həmin institutun Terminologiya şöbəsinin müdiri, professor Sayalı Sadıqova və başqaları professor A.Qurbanovun yüksək intellekt səviyyəsinə, geniş dünyagörüşünə, zəngin mənəviyyata malik alim, təmkinli və müdrük ziyalı olduğunu vurğulayaraq onunla bağlı xatirələrini bölüşüblər.

Sonda professor A.Qurbanovun




oğlu Ramin Qurbanov ailələrinin adından çıxış edərək atasının xatirəsinə göstərilən hörmət və ehtirama görə ADPU-nun rəhbərliyinə, həmçinin tədbirin ərsəyə gəlməsində əməyi keçən hər kəsə təşəkkür edib.

**Könül Nəzərova**

# "Bahar nağılı"adlı Novruz bayramı şənliyi

**Martın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin təşəbbüsü və təşkilatçılığı ilə Baharın gəlişinə həsr olunan "Bahar nağılı" adlı bayram şənliyi keçirilib. Bayram şənliyində ADPU-nun rəhbərliyi, müəllim və tələbələri iştirak ediblər.**

Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bildirib ki, Novruz bayramı xalqımızın ən gözəl, ən əlamətdar bayramıdır. Azərbaycanda bu bayram çox qədim zamanlardan əsl milli bayram kimi qeyd olunur. Xalqımız yazın gəlişini ilaxır çərşənbələrindən Novruz axşamınadək müxtəlif şənlik və mərasimlərlə qarşılayır. Təbiətin canlanması ilə başlayan hər yeni ilin firavanlıq, xoşbəxtlik və əmin-amanlıq gətirməsini arzulayır. Novruz bayramı həm də xalqımızın gələcəyə olan inam hissini, ürək açıqlığını, qonaqpərvərliyini, mehribançılıq və dostluq duyğularını ifadə edir. ADPU-nun kollektivi bu bayrama böyük




uğurlarla gəlib və gələcəkdə daha böyük uğurlar qazanmağı planlaşdırır. Biz Azərbaycan məktəblərini yüksək səviyyəli pedaqoji kadrlarla təmin etməliyik. Rektor çıxışının sonunda müəllim və tələbələri bayram münasibətilə təbrik edərək onlara möhkəm cansağlığı, uğurlar arzulayıb və tədbirin təşkilatçılarına təşəkkür edib.

Sonra tələbələrin hazırladıqları "Bahar nağılı" adlı tamaşa təqdim edilib. Tamaşada Novruz personajları Kosa, Keçəl və Bahar qızın şən zarafatları, həmçinin tələbələrin hazırladıqları digər səhnələr, milli geyimdə olan tələbələrin və şagirdlərin musiqi sədaları altında ifa etdikləri rəqslər, bayramın rəmzlərindən və adətlərindən olan səməni, xonça iştirakçılar tərəfindən maraqla qarşılanıb.



Bayram şənliyində fakültələrin tələbələrinin hazırladıqları bayram xonçaları nümayiş etdirilib.

Əməkdar artist İlkin Əhmədovun və müğənni Gülay Zeynallının ifa etdikləri bir-birindən gözəl mahnılar tədbir iştirakçılarında yüksək əhvali-ruhiyyə yaradıb, onlara xoş, unudulmaz dəqiqələr bəxş edib.

**Nurlan Səmədov**

# İndoneziyanın ölkəmizdəki səfirinin ADPU-nun tələbələri ilə görüşü

Martın 13-də İndoneziya Respublikasının Azərbaycan Respublikasındakı fövqəladə və səlahiyyətli səfiri, professor Husnan bəy Fanani, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tələbələri ilə görüşüb. Qeyd edək ki, fevralın




14-də ADPU-nun rektoru, professor Cəfər Cəfərovla görüşən səfir Husnan bəy Fanani yaxın gələcəkdə universitetin tələbələri ilə görüşmək arzusunda olduğunu bildirmişdi. ADPU-nun rəhbərliyi səfirin bu arzusunun həyata keçməsinə dəstək verərək onunla universitet tələbələrinin görüşünü təşkil ediblər. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Beynəlxalq əlaqələr şöbəsinin, Tədqiqat və inkişaf şöbəsinin əməkdaşları, səfirliyin nümayəndələri iştirak ediblər.

Görüşü giriş sözü ilə açan rektor Cəfər Cəfərov qonaqları salamlayıb və onları rəhbərlik etdiyi ali təhsil müəssisəsində görməkdən məmnunluq duyduğunu bildirib. Qeyd edib ki, İndoneziya dünyanın ən böyük müsəlman ölkəsidir. "Azərbaycan" qəzetinin bugünkü nömrəsində səfir Husnan bəy Fanani ilə geniş müsahibə dərc olunub. Bu müsahibəsində səfir Azərbaycanla bağlı maraqlı fikirlər söyləyib. Husnan bəy Fanani həm də musiqiçi, rəssam və atletdir.

Səfir Husnan bəy Fanani görüşün təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Husnan bəy Fanani bildirib ki, 30 ildir səfir kimi fəaliyyət göstərir. Novruz bayramı ərəfəsində ADPU-nun tələbələri ilə görüşmək və onların qarşısında çıxış etmək çox sevindiricidir və bundan qürur duyur. Baharın gəlişini, onun istisini sizinlə bölüşmək mənə çox xoşdur. Gənclər Azərbaycanın gələcəyidir. Onlar gələcək liderlərdir.

Görüşdə öz ölkəsi haqqında təqdimatla çıxış edən səfir ölkəsinin tarixi, coğrafi mövqeyi, mədəniyyəti, ictimai-siyasi və iqtisadi vəziyyəti, ordusu, İndoneziya-Azərbaycan əlaqələri barədə ətraflı məlumat verib. Bildirib ki, İndoneziya dövləti Cənub-Şərqi Asiyada yerləşir. İndoneziyanın paytaxtı Cakarta şəhəridir. Unitar dövlətdir, prezident respublikasıdır. Əhalisinin sayına görə dünyada dördüncü yerdə dayanır. Dövlət dili indoneziya dilidir. Əhalisinin təxminən 88 faizi İslam dininə etiqad edir. İqtisadiyyatı dinamik inkişaf edir. Azərbaycan Odlar Yurdu, İndoneziya isə Odlar halqasıdır. Azərbaycan xalqı zəngin tarixi keçmişə, çoxəsrlik mədəniyyətə malikdir. Əfzələddin Xaqani, Nizami Gəncəvi, Nəsirəddin Tusi, İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Nəriman Nərimanov və digər böyük şairləri, yazıçıları, mütəfəkkirləri, görkəmli ictimai-siyasi xadimləri var. Nizami Gəncəvi öz "Xəmsə"si ilə bütün dünya ədəbiyyatına təsir edib. Azərbaycan Qafqazın ən gözəl ölkə-



sidir. Azərbaycanın əsrarəngiz, füsunkar, təkrarsız təbiəti var. Ölkənizin turizm potensialı yüksəkdir. Bu səbəbdən Azərbaycana gələn turistlərin sayı ildən-ilə artır. Azərbaycana gələn əcnəbilərin arasında biznes və təhsilə maraq göstərənlərin sayı kifayət qədərdir. İndoneziya Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həllində Azərbaycanın haqlı və ədalətli mövqeyini, ərazi bütövlüyünü birmənalı şəkildə dəstəkləyir.

Səfir Husnan bəy Fananinin çıxışını ölkəmizə hörmət və sevgi ruhunda qurması, pianoda Azərbaycanın xalq mahnısı olan "Sarı gəlin" mahnısını, eləcə də digər mahnıları ifa etməsi iştirakçılar tərəfindən böyük ruh yüksəkliyi ilə qarşılanıb.

**Mənsur Qüdrətoğlu**



# Elm və innovasiyalar şöbəsi "Elm günü" ilə bağlı seminar-sərgi keçirdi

Martın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Elm və innovasiyalar şöbəsinin təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Fizika İnstitutunun Kristalloqrafiya laboratoriyasının müdiri, fizika üzrə elmlər doktoru, professor İmaməddin Əmiraslanov"Kristallar, kvazikristallar, türk xalq sənəti" mövzusunda universitetin professor-müəllim heyətinə seminarı keçirildi. Seminardan öncə alimin uzun illər kristallar üzərində apardığı tədqiqatlar zamanı kristalın daxilində baş verən proseslərdən çəkilən şəkillər və fonsuz tamamlanma sahəsi üzrə çəkilmiş nəfis və incə rəsmlərin foto-sərgisinə baxış keçirildi. Professor İ.Əmiraslanov izləyicilərin böyük marağına səbəb olan foto-sərgi barədə ətraflı məlumat verdi.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov "Elm günü"nün təsis edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 9 aprel 2018-ci il tarixli Sərəncamının icrası ilə əlaqədar ADPU-da silsilə tədbirlərin keçirildiyini diqqətə çatdıraraq keçirilən seminarın əhə-



miyyətindən danışdı. Kristalloqrafiyanın bu gün dünyada olduqca aktuallıq kəsb edən sahələrdən birinə çevrildiyi qeyd olundu. Bu elm sahəsinin köməkliyi ilə bir çox sənətkarlıq sahələri də sürətlə inkişaf etməyə başlamışdır. Məhz buna görə də Azərbaycanda kristalloqrafiya məktəbinin banilərindən biri olan AMEA-nın müxbir üzvü, mərhum Xudu Məmmədov məktəbinin yetirməsi, uzun illər Tayvanın paytaxtı Taybey şəhərindəki elmi-tədqiqat mərkəzində çalışmış, bu sahədə özünəməxsus araşdırmaları və tətbiqləri olan professor İ.Əmiraslanovun"Kristallar, kvazikristallar, türk xalq sənəti" mövzusunda məruzə etmək üçün ADPU-ya dəvət edildiyini vurğulayan Asəf Zamanov dəvəti qəbul edib gəldiyinə görə professor İ. Əmiraslanova universitetin rəhbərliyi və professor-müəllim heyəti adından təşəkkür etdi.

Professor İ.Əmiraslanov çıxış edərək ADPU-nun rektoru, professor Cəfər Cəfərova, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanova təşəkkürünü bildirdi, tədbir iştirakçılarını qarşıdan gələn bay-



ramlar münasibətilə təbrik etdi. Məruzəyə Argentinanın məşhur inqilabçı siyasətçisi Çe Gevaranın "Gəlin realist olaq. Mümkün olmayanı tələb edək!" fikirləri ilə başlayan professor İ.Əmiraslanov kristallar, kvazikristallar üzərində aparılmış tədqiqatlardan geniş bəhs etdi. İkili, üçlü, dördlü, beşli simmetriyalara malik quruluşların modellərini, xalçaçılıq və xəttatlıqda işlədilməsindən bəhs edən olduqca maraqlı tədqiqatlar haqqında məlumat verdi. Lektor həmçinin kristalloqrafik simmetrikliyə əsaslanaraq özünün hazırladığı bir çox sənət əsərlərini də dinləyicilərə göstərərək bu səpgidə işlərin gələcəkdə istehsalçılar tərəfindən böyük marağa səbəb olacağını bildirdi.

Seminar iştirakçılarının çoxsaylı suallarını cavablandıran professor İ.Əmiraslanov məruzəni maraqla dinlədiklərinə görə dinləyicilərə təşəkkürünü bildirdi.

Sonda dinləyicilər professor İ.Əmiraslanovla xatirə şəkili çəkdirdilər.

# Magistrantların elmi-pedaqoji təcrübəsinin yekunu və elmi-tədqiqat təcrübəsinin başlanması ilə bağlı konfrans

Martın 15-də ali təhsilin magistratura səviyyəsində təhsil alan II tədris ili magistrantlarının elmi-pedaqoji təcrübəsinin yekunu və elmi-tədqiqat təcrübəsinin başlanması ilə bağlı konfrans keçirilib.

Konfransda giriş sözü ilə Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edib. Elmi-pedaqoji təcrübənin gedişi, elm-tədqiqat təcrübəsində görüləcək işlər və qarşıda duran vəzifələr barəsində Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov məruzə edib.

Konfransda İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, Fizikanın tədrisi metodikası kafedrasının professoru İsa İsmayılov, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti Füzuli Əsgərli, Biologiya və onun tədrisi metodikası kafedrasının dosenti Əliyannağı Məhərrəmov, Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev, Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlov və magistrantlar çıxış edərək, elmi-pedaqoji təcrübənin keçirilməsi barədə öz fikirlərini söyləyiblər. Magistrantlar keçdikləri sınaq dərslərinin videogörüntülərini nümayiş etdiriblər.

Sonda professor Asəf Zamanov magistrantların suallarını cavablandırıb.

# Cəfər Cabbarlının 120 illiyinə həsr olunmuş yubiley tədbiri

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə görkəmli dramaturq, şair və nasir Cəfər Cabbarlının 120 illiyinə həsr olunmuş yubiley tədbiri keçirilib. Qeyd edək ki, tədbirin keçirilməsi üçün ADPU-nun və eləcə də ölkəmizin tanınmış, nüfuzlu alim-mütəxəssislərindən, ziyalılarından ibarət Təşkilat Komitəsi yaradılıb. Tədbirdə universitetin rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) təmsilçiləri, müəllim və tələbələr iştirak ediblər. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.




Tədbiri giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, bu gün ADPU-da bir mənəviyyat, ədəbiyyat bayramıdır. Biz görkəmli dramaturq, şair və nasir Cəfər Cabbarlının 120 illiyinə həsr olunmuş yubiley tədbiri keçiririk. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2018-ci il dekabr ayının 17-də Cəfər Cabbarlının 120 illiyinin qeyd edilməsi haqqında Sərəncam imzalayıb. Sərəncamda qeyd edilir ki, 2019-cu ilin mart ayında Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, böyük şair, yazıçı və dramaturq Cəfər Qafar oğlu Cabbarlının anadan olmasının 120 illiyi tamam olur. Cəfər Cabbarlı XX əsr Azərbaycan ədəbiyyatının geniş şöhrət tapmış nadir simalarındandır. Klassik ədəbi irs zəminində yetişən ədib milli ədəbiyyatın parlaq ənənələrini qorumaqla bərabər, yenilik və müasirlik uğrunda mübarizəni yaradıcılığının əsas qayəsinə çevirmişdir. Dramaturgiyamızın təşəkkülü və yüksəlişi tarixində yeni mərhələnin təməlini qoyan Cəfər Cabbarlının əsərləri milli teatrda mühüm hadisə kimi dəyərləndirilmiş, uzun illər boyu tamaşaçıların bir neçə nəslinin estetik zövqünün formalaşmasında əvəzsiz rol oynamışdır. Ədəbi-mədəni proseslərin fəal qurucularından biri olaraq sənətkar yaratdığı güclü xarakterlər və koloritli obrazlarla bədii-estetik fikir salnaməmizə misilsiz töhfələr vermişdir. Cəfər Cabbarlı şəxsiyyət azadlığının və humanizmin, milli azadlıq və istiqlal ideallarının tərənnümçüsü olmuş, çoxcəhətli ədəbi və ictimai fəaliyyəti boyunca daim xalqımızın dünya mədəniyyəti səhnəsində layiqli mövqe qazanmasına çalışmışdır. Bizim bugünkü tədbirimiz yuxarıda qeyd etdiyim Sərəncama uyğun olaraq keçirilir. Eyni zamanda bu tədbir böyük ədibə olan sevgimizdən irəli gəlir.




Rektor çıxışında qeyd edib ki, Azərbaycan ədəbiyyatı qədim və zəngin tarixə malikdir. Xalqımızın Əfzələddin Xaqani, Nizami Gəncəvi, İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Molla Pənah Vaqif, Mirzə Fətəli Axundzadə, Seyid Əzim Şirvani, Cəlil Məmmədquluzadə, Nəcəf bəy Vəzirov, Mirzə Ələkbər Sabir, Nəriman Nərimanov, Əli bəy Hüseynzadə və digər böyük şairləri, yazıçıları var. Əgər buraya Sovet dövründə yaşayıb-yaratmış şair və ədibləri də əlavə etsək, geniş bir mənzərə alınar. Cəfər Cabbarlı XX əsr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsidir. Cəmi 35 il yaşamış Cəfər Cabbarlı zəngin və məhsuldar yaradıcılıq yolu keçib. O, həm lirik, həm də satirik şeirlərin müəllifidir. Dramaturgiya onun yaradıcılığında xüsusi yer tutur. Xalqımızın teatr zövqünün formalaşmasında Cəfər Cabbarlının dramaturgiyasının böyük rolu olub. Cəfər Cabbarlı Azərbaycan Xalq Cümhuriyyəti dövründə ictimai-siyasi fəaliyyət göstərib, müstəqil dövlətin güclənməsinə dəstək verib. Buna görə təqiblərə məruz qalıb, iki dəfə həbs edilib. Böyük yazıçının zəngin bədii irsi həmişə müasirliyini, aktuallığını saxlayır. Rektor çıxışının sonunda tədbirin təşkilatçılarına təşəkkür edib və onlara uğurlar arzulayıb.

Tədbirdə Cəfər Cabbarlı haqqında videoçarx nümayiş etdirilib.

Filologiya fakültəsinin Azərbaycan və dünya ədəbiyyatı kafedrasının professoru Təyyar Salamoğlu "Cəfər Cabbarlının dramaturgiyası: sənətkar dünyagörüşünün ziqzaqları" mövzusunda, həmin kafedranın dosenti Təranə Turan Rəhimli isə "Cəfər Cabbarlının poeziyası və nəsri sənət həqiqətləri kontekstində" mövzusunda məruzələrlə çıxış ediblər. Məruzələrdə Cəfər Cabbarlının bədii yaradıcılığı, sənətkarlıq xüsusiyyətləri geniş təhlil edilib, onun milli və bəşəri yazıçı olduğu xüsusi vurğulanıb. Dolğun və məzmunlu məruzələr iştirakçılar tərəfindən böyük maraqla qarşılanıb.



AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Kamran Əliyev, AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun direktor müavini, filologiya üzrə elmlər doktoru Əlizadə Əsgərli, şair-publisist, "Kredo" qəzetinin baş redaktoru Əli Rza Xələfli və başqaları çıxış edərək yazıçının yaradıcılığı ilə bağlı fikirlərini bölüşüblər.

Yazıçının nəvəsi Qəmər Seyfəddinqızı çıxış edərək tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Cəfər Cabbarlının şeirləri əsasında hazırlanmış bədii-musiqili kompozisiya tədbirə xüsusi rəng qatıb.

Sonda yekun sözü ilə çıxış edən Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova tədbirin keçirilməsinə görə verdiyi dəstəyə görə universitetin rəhbərliyinə, həmçinin bu işdə əməyi keçən hər kəsə təşəkkür edib.

**Orxan Fəxrəddinoğlu**

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsində Soltan Hacıbəyovun 100 illik yubileyinə həsr olunmuş tədbir



"Elm günü"nün təsis edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 9 aprel 2018-ci il tarixli Sərəncamının icrası ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) silsilə tədbirlər həyata keçirilir. Martın 18-də Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Musiqi və onun tədrisi metodikası kafedrasında keçirilən növbəti tədbir Azərbaycanın görkəmli bəstəkarı, ictimai xadim, SSRİ və Azərbaycan Respublikasının Xalq artisti, Dövlət mükafatı laureatı, Sosialist Əməyi Qəhrəmanı, pedaqoq Soltan Hacıbəyovun 100 illik yubileyinə həsr olunub.

Musiqi və onun tədrisi metodikası kafedrasının mudiri, professor Zemfira Abdullayeva qonaqları salamlayaraq sözü ADPU-nun rektoru, professor Cəfər Cəfərova verib. Rektor Cəfər Cəfərov qeyd edib ki, müasir musiqi mədəniyyəti xəzinəmizə misilsiz töhfələr vermiş S.Hacıbəyov milli musiqi sənətində aparıcı simalardan biridir. S.Hacıbəyovun özünəməxsus orijinal yaradıcılığı ölkəmizdə və onun hüdudlarından kənarda şöhrət qazanmışdır.

Fikrət Əmirov, Qara Qarayev, Cövdət Hacıyev və dövrünün bir çox bəstəkarları kimi S.Hacıbəyov da öz yaradıcılığında Azərbaycanın musiqi klassikləri olan Üzeyir Hacıbəyli və Müslüm Maqomayevin ənənələrinə sadiq qalaraq, milli formalar sahəsindəki axtarışlarını inkişaf etdirmiş, Azərbaycan simfonik musiqisinin inkişafında mühüm rol oynamışdır. S. Hacıbəyov müasir mövzuda ilk milli baletin müəllifi kimi tanınmışdır.

S.Hacıbəyovun bir çox əsərləri respublikamızın ictimaiyyəti tərəfindən yüksək qiymətləndirilərək, tez bir zamanda populyar əsərlər sırasına daxil olmuşdur. Onun "Karvan" simfonik lövhəsi respublikamızın hüdudlarından kənarda səslənmişdir. Bu əsər müasir dövrümüzdə də səslənərək müəllifinə şöhrət gətirir. Bəstəkarın "Gülşən" baleti SSRİ Dövlət mükafatına layiq görülmüşdür.

S. Hacıbəyov istedadlı bəstəkar olmaqla yanaşı, musiqi sahəsində görkəmli ictimai xadim, gözəl təşkilatçı idi. O, Azərbaycan Dövlət Flarmoniyasının bədii rəhbəri, direktoru, Bəstəkarlar İttifaqının birinci katibi,1963-cü ildən İdarə Heyətinin üzvü, Azərbaycan Dövlət Konservatoriyasının rektoru olmuşdur.

Sonra söz S.Hacıbəyovun gəlini, Bakı Musiqi Akademiyasının professoru, Xalq artisti Ülviyyə Hacıbəyovaya verilib. Professor Ü.Hacıbəyova çıxışında tədbirin keçirilməsinə görə universitetin rəhbərliyinə dərin təşəkkürünü bildirib, bəstəkarla bağlı xatirələrini bölüşüb və royal arxasına keçərək S.Hacıbəyovun əsərini ifa edib.



Bakı Musiqi Akademiyasının Elmi işlər üzrə prorektoru, Əməkdar incəsənət xadimi, professor Gülnaz Abdullazadə çıxış edərək bəstəkarın ictimai fəaliyyəti, həmçinin Azərbaycan Dövlət Konservatoriyasının rektoru kimi fəaliyyətindən danışıb.

Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin dosenti Gülnar Verdiyeva "Soltan Hacıbəyovun yaradıcılığının səciyyəvi xüsusiyyətləri" mövzusunda çıxışında onun yaradıcılığının dərin köklərlə milli musiqiyə bağlı olduğunu vurğulayıb.

Sonra bəstəkarın iki vokal əsəri Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetin tələbələrinin ifasinda səsləndirilib.

Tədbirin sonunda professor Minara Dadaşova və dosent Afət Həsənova bəstəkarın simfonik əsərləri barədə maraqlı məruzələrlə çıxış ediblər.

**Mahirə Məhərrəmqızı**

# Fəlsəfə doktoru proqramı üzrə təhsil alan doktorant və dissertantlarla görüş



"Elm günü"nün təsis edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 9 aprel 2018-ci il tarixli Sərəncamının icrası ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) silsilə tədbirlər həyata keçirilir. Belə tədbirlərdən biri də martın 13-də fəlsəfə doktoru proqramı üzrə təhsil alan doktorant və dissertantlarla görüşün keçirilməsidir. Görüşdə 2016, 2017, 2018-ci illərdə ADPU-ya qəbul olunmuş doktorant və dissertantlar iştirak etdilər.



Tədbiri giriş sözü ilə açan Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov doktorant və dissertantları salamladı. Qeyd edildi ki, kafedralarda doktorantların və dissertantların dissertasiya işlərinin mövzuları müzakirə edilərkən ciddi təhlillər və araşdırmalar aparılmalı, onun aktual olmasına, ədəbiyyatda necə əks olunmasına, elmi-texniki və texnoloji tərəqqinin tələblərinə cavab verməsinə xüsusi diqqət yetirməlidir. Mövzular müəyyənləşdirilərkən elmin, təhsilin müasir və perspektiv inkişafı, elm və təhsil qarşısında duran real vəzifələr, bu sahədəki dövlət siyasəti, aparılan islahatlar və ölkəmizin daha da inkişaf etməsini təmin edən prioritet istiqamətlər nəzərə alınmalıdır.

Tədbirdə həmçinin Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov və baş mütəxəssis Sevinc Quliyeva çıxış edərək doktorantlara və dissertantlara lazımi məsləhətlər verib, onları maraqlandıran sualları cavablandırdılar. Doktorant və dissertantlar universitetdə onlara yaradılan şəraitə görə rəhbərlyə minnətdarlıqlarını bildirdilər.

# “Milli iqtisadiyyat, modernləşmə və istehlakçı hüquqları” mövzusunda dəyirmi masa

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Ümumdünya İstehlakçıların Hüquqlarının Müdafiəsi Günü münasibətilə tələbələr üçün “Milli iqtisadiyyat, modernləşmə və istehlakçı hüquqları” mövzusunda maarifləndirici dəyirmi masa keçirilib. Tədbirdə İqtisadiyyat Nazirliyi yanında Antiinhisar Siyasəti və İstehlakçıların Hüquqlarının Müdafiəsi Dövlət Xidmətinin, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Azərbaycan Respublikasının Qida Təhlükəsizliyi Agentliyinin, Azad İstehlakçılar Birliyinin məsul şəxsləri iştirak ediblər.

Dəyirmi masanı giriş sözü ilə açan ADPU-nun İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümud Mehdiyev bildirib ki, 15 Mart-Ümumdünya İstehlakçıların Hüquqlarının Müdafiəsi Günü beynəlxalq miqyasda qeyd edilir. Bugünkü tədbirin keçirilməsində məqsəd istehlakçıların hüquqlarının qorunması sahəsində mövcud vəziyyəti təhlil etmək, aidiyyəti dövlət təşkilatlarının bu sahədə vəzifələri barədə müzakirələr aparmaq, dövlət təşkilatları-istehlakçı əlaqələrində sivil münasibətlərin formalaşdırılmasına nail olmaq, istehlakçı hüquqları ilə bağlı həyata keçiriləcək təbliğat-təşviqat və digər maarifləndirmə tədbirlərinin istiqamətlərini müəyyənləşdirməkdən ibarətdir. Prorektor Ü.Mehdiyev universitetin rəhbərliyi və kollektivi adından belə aktual mövzuda maarifləndirici tədbirin keçirilməsinə görə tədbirin təşkilatçılarına təşəkkür edib və onlara uğurlar arzulayıb.

Antiinhisar Siyasəti və İstehlakçıların Hüquqlarının Müdafiəsi Dövlət Xidmətinin rəis müavini Araz Əliyev tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə minnətdarlığını bildirib və tədbir iştirakçılarını qarşıdan gələn Novruz bayramı münasibətilə təbrik edib.





Dəyirmi masada Antiinhisar Siyasəti və İstehlakçıların Hüquqlarının Müdafiəsi Dövlət Xidmətinin rəis müavini Araz Əliyev “İstehlakçıların hüquqlarının qorunması davamlı iqtisadi artım və məsuliyyətli istehlakın təmin edilməsi kontekstində” mövzusunda, Antiinhisar Siyasəti və İstehlakçıların Hüquqlarının Müdafiəsi Dövlət Xidmətinin sektor müdiri Yusif Hüseynov “İstehlakçıların hüquqlarının müdafiəsində yeni yanaşma: Hər bir istehlakçı öz hüquqlarını bilməlidir” mövzusunda, Qida Təhlükəsizliyi Agentliyinin şöbə müdiri Nizami Zeynalov “Qida məhsulları bazarında istehlakçıların hüquqları və onların qorunması sahəsində görülən işlər” mövzusunda, Azad İstehlakçılar Birliyinin sədri Eyyub Hüseynov “İstehlakçı hüquqlarının təmin olunmasında modernləşmə xətti başlıca istiqamət kimi” mövzusunda məruzələrlə çıxış ediblər. Qeyd edilib ki, respublikamızda istehlakçıların hüquqları dövlət tərəfindən qorunur. Ölkəmizdə istehlakçıların hüquqlarının müdafiəsi sahəsində hüquqi bazanın əsasını xalqımızın ümummilli lideri Heydər Əliyevin təşəbbüsü ilə 19 sentyabr 1995-ci il tarixində qəbul edilmiş “İstehlakçıların hüquqlarının müdafiəsi haqqında” Azərbaycan Respublikasının Qanunu və digər normativ hüquqi aktlar təşkil edir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin dəqiq düşünülmüş, cəmiyyətin tələb və reallıqlarını nəzərə alan siyasəti nəticəsində ölkəmizin sürətli iqtisadi inkişafı təmin edilib. Son illər istehlakçı hüquqlarının müdafiəsi dövlətin iqtisadi siyasətinin əsas istiqamətlərindən birinə çevrilib. İstehsalçı və satıcı malın keyfiyyətinə və təhlükəsizliyinə zəmanət verməlidir. Mal haqqında istehlakçıya dolğun və düzgün məlumat verilməlidir. Məruzəçilərin çıxışlarında alqı-satqı, iş görülməsi və xidmət göstərilməsi zamanı müqavilə öhdəlikləri, elektron ticarət informasiya sistemlərindən istifadə edilməklə malların alqı-satqısı, xidmətlərin göstərilməsi və işlərin görülməsi, qida təhlükəsizliyinin təmin edilməsi, istehlakçıların hüquqlarının qorunması sahəsində ictimai təşkilatların rolu və digər vacib məqamlar barədə ətraflı məlumatlar verilib.

Tədbirdə həmçinin yeni dövrün tələblərinə uyğun olaraq istehlakçı hüquqlarının müdafiəsinin gücləndirilməsi məqsədilə bu sahədə aparılacaq təkmilləşdirmələr barədə iştirakçıların təklifləri dinlənilib, maraqlı və geniş fikir mübadiləsi aparılıb.

Tələbə-gənclərə maarifləndirici bukletlər və broşürlər paylanılıb, onların mövzu ilə bağlı sualları cavablandırılıb.

**Günay Ramizqızı**

# Fizika və texnologiya fakültəsində “STEM təhsil” mövzusunda dəyirmi masa

“Elm günü” ilə əlaqədar olaraq martın 14-də Fizika və texnologiya fakültəsində “STEM təhsil” mövzusunda dəyirmi masa keçirildi. Dəyirmi masanı giriş sözü ilə fakültənin dekanı, dosent Arzu Daşdəmirov açdı. Qeyd etdi ki, müasir təhsil sistemi tədris prosesinə innovativ texnologiyaların tətbiqini tələb edir. Belə texnologiyalardan biri olan STEM texnologiyasının tətbiqi şagirdlərə qazandıqları nəzəri bilikləri praktikada tətbiq etməyə imkan verir. Bu texnologiya əsasında şagirdlər riyazi düsturları və fiziki qanunları necə tətbiq etməli olduqlarını əyani görür və bu da şagirdlərin intellektual potensialının açılmasına kömək edir.



Dosent A. Daşdəmirov STEM-in hazırda parçalanmış, bir-biri ilə əlaqəsini itirmiş və yalnız nəzəri biliklərin əzbərlədilməsi yolu ilə öyrədilən təbiət elmlərinin bir tam şəkildə birləşərək, layihə əsaslı bir təhsil modeli olduğunu söylədi. Bundan başqa o, ölkəmizdə fəaliyyət göstərən “Engineering for kids”, “STEM Education Azarbaycan” və Hədəf STEM liseyi kimi tanınan STEM mərkəzlərinin bu texnologiyanın Azərbaycanda tətbiqi ilə məşğul olduğunu söylədi.

Sonra STEM təhsil ilə bağlı Fizikanın tədrisi metodikası kafedrasının dosenti Qalib Şərifov ətraflı təqdimat etdi. O, STEM təhsilin tarixi, mahiyyəti, dünyada tətbiq coğrafiyası və STEM müəllimlərinin qəbul olunmuş kompetensiyaları haqqında ətraflı danışdı.

“STEM Education Azerbaijan” Şirkətinin rəhbəri Ceyhun Cabbarov STEM təhsilin Təhsil Nazirliyi tərəfindən tədrisə məqsədyönlü şəkildə tətbiq edilməsi təşəbbüsünü nəzərə alaraq ADPU-nun nəzdində STEM müəllimlərinin hazırlanmasına ehtiyacın duyulduğunu qeyd etdi.

Hədəf STEM liseyinin elmi məsləhətçisi Yalçın İslamzadə şagirdlərin STEM dərslərə olan həvəsini və bu dərsin nəticəsi kimi şagirdlərdə bilik, bacarıqların və vərdişlərin formalaşmasını söylədi və çıxış edənlərin fikrinə dəstək olaraq STEM müəllimlərinin ADPU-da hazırlanmasını tam məqsədəuyğun hesab etdi.

ADPU-nun Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev STEM təhsilin tətbiq coğrafiyasının genişlənməsini qeyd edərək bu təhsil modelinin dünyada innovativ bir təhsil modeli olduğunu söylədi. Təhsil Nazirliyi STEM-in pilot layihə kimi ümumtəhsil məktəblərində tətbiq olunmasını reallaşdırmaq istəyir və təlim məqsədilə 50 nəfər müəllim İsrailə göndərilib.

Mövzu ilə bağlı Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva, Riyaziyyat və informatika fakültəsinin dekan müavini, dosent Allahverdi Cəfərov, kafedra müdirləri, dosent Əli Zalov, professor Azadxan Adıgözəlov, dosent Nizam Mehdizadə və professor Şükür Əlizadə də öz fikirlərini bölüşdülər.

Sonra Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov çıxış etdi. Dosent E. Aslanov STEM təhsilin artıq Qazaxıstan, Gürcüstan, Türkiyədə tətbiqinə başlanıldığını dedi. O, dəyirmi masada söylənilən fikirlərin əsaslı olduğunu və STEM təhsilin umümtəhsil məktəblərində uğurla tətbiq olunması üçün onun mahiyyətinin ictimaiyyətə geniş miqyasda çatdırılmasının zərurətini söylədi.

Yekunda dosent E.Aslanov bu dəyirmi masanı təşkil edən fakültənin dekanı, dosent A.Daşdəmirova və tədbir iştirakçılarına təşəkkürünü bildirdi.

# Riyaziyyat və informatika fakültəsində “Elm günü” ilə bağlı tədbir

Martın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Riyaziyyat və informatika fakültəsində “Elm günü”nün təsis edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 9 aprel 2018-ci il tarixli Sərəncamına uyğun olaraq tədbir keçirilib. Tədbirdə Riyaziyyat və informatika fakültəsinin professor-müəllim heyəti və tələbələri iştirak ediblər.



Tədbiri giriş sözü ilə fakültənin dekan müavini, dosent Allahverdi Cəfərov açıb. Tədbirə dəvət olunmuş Azərbaycan Milli Elmlər Akademiyasının Mexanika və Riyaziyyat İnstitutunun professoru Məmməd Bayramoğluna və Bakı Dövlət Universitetinin professoru Hamlet Quliyevə söz verilib. Hər iki alim geniş və məzmunlu çıxış ediblər. Tədbir iştirakçılar tərəfindən maraqla qarşılanıb.

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində “Elm günü”nə həsr olunmuş növbəti tədbir

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində “Elm günü”nə həsr olunmuş növbəti tədbir keçirilib. Tədbirə Azərbaycanın tanınmış alimi, Bakı Dövlət Universitetinin professoru, fəlsəfə üzrə elmlər doktoru Əziz Məmmədov dəvət olunub. Tədbirdə fakültənin kafedra müdirləri professor Müseyib İlyasov, professor Ramiz Əliyev, dosent Nailə Hüseynova və kafedraların müəllimləri iştirak ediblər.



Görüşü giriş sözü ilə fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva açaraq tədbirin əhəmiyyəti haqqında məlumat verib. Sonra söz professor Əziz Məmmədova verilib.

Məruzəçi “Sinergetika: cəmiyyət və təhsil” mövzusunda professor-müəllim, magistrant və bakalavrlar qarşısında çox maraqlı çıxış edib. Professor Ə.Məmmədovun sinergetika, sinergetik təfəkkür, təbiət, cəmiyyət və təhsilin qarşılıqlı əlaqəsi haqqında geniş və hərtərəfli çıxışı dinləyicilər tərəfindən maraqla qarşılanıb.

Məruzəçi dinləyiciləri maraqlandıran suallara cavablar verib.

Sonda fakültənin dekanı Ş.Əliyeva çıxış edərək professor Ə.Məmmədovun məruzəsini yüksək dəyərləndirdiyini vurğulayaraq alimə minnətdarlığını bildirib.

# ADPU-nun Quba Filialında tədbir

Martın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında son dövrlər ölkəmizdə iqtisadi və sosial məsələlərlə bağlı görülmüş işlərlə əlaqədar 25 fevral 2019-cu il tarixdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin yanında keçirilmiş müşavirəyə həsr olunan tədbir keçirilib. Tədbirdə Quba Rayon İcra Hakimiyyətinin(RİH) başçısı Ziyəddin Əliyev iştirak edib.



Tədbirdə çıxış edən Quba RİH-in başçısı Ziyəddin Əliyev, filialın direktoru, professor Əli Allahverdiyev, Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Pedaqoji fakültənin dekanı, filologiya üzrə fəlsəfə doktoru Qələmşah İdrisov, dekan müavini Nübar Bayramova, Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Güləddin Həmzəyev son illər ölkədə aparılan islahatlar, görülən işlər haqqında haqqında ətraflı məlumat verib, dövlət başçımız cənab İlham Əliyevin apardığı uğurlu daxili və xarici siyasətin müsbət nəticələr verdiyini, bu siyasət sayəsində Azərbaycan vətəndaşlarının rifah halının yüksəldiyini xüsusi vurğulayıblar.

# Kimya və biologiya fakültəsində elmi-praktik seminar

"Elm günü" münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsində "Ömür" Klinikasının, Dövlət Təhlükəsizliyi Xidmətinin Qospitalının və Fövqəladə Hallar Nazirliyinin birgə təşkilatçılığı ilə "İnsan sağlamlığının qorunması və genofondun saxlanması problemləri və perspektivləri" mövzusunda elmi-praktik seminar keçirilib. Seminarda fakültənin dekanı, dosent Elnarə Mehbalıyeva insan sağlamlığının qorunmasının tədris əhəmiyyəti barədə çıxış edib. Dosent E.Mehbalıyeva cəmiyyətin inkişafında gənc nəslin sağlamlığının əsas götürülməsinin vacib olduğunu qeyd edib. Bütün elmlər insan xoşbəxtliyinə, insan sağlamlığına xidmət edir. Biz müəllim olaraq bilirik ki, tələbə sağlam olmasa, onun heç bir elmi öyrənməsi və mənimsəməsi mümkün deyil.





"Genmodifikasiyaedici qidalar və onlara qarşı maarifləndirmə tədbirləri" mövzusunda Biologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Anaxanım Yusifova çıxış edib. Çıxışda insan nəslinin davamlı inkişafı üçün ciddi maneələrin qarşısının alınması məsələləri qeyd olunub. Son 10 ildə dünyanın bütün qitələrində qida mənşəli xəstəliklərin, qida zəhərlənmələrinin ciddi artması qeydə alınıb. Buna görə dünyada qida təhlükəsizliyi ən aktual probem hesab olunur. Avropada və digər dünya ölkələrində Avropa Qida Təhlükəsizliyi Qurumu (EFSA) yaradılıb. Bu qurumun əsas vəzifələrindən biri əhalini qida məhsullarının mövcud və potensial riskləri barədə məlumatlandırmaqdan ibarətdir. BMT-nin Ərzaq və Kənd Təsərrüfatı Təşkilatı və Ümumdünya Səhiyyə Təşkilatı qida mənşəli təhlükələrin xarakterinə uyğun olaraq, onların qarşısının alınması və aradan qaldırılması strategiyasına nəzarət edir.

Dosent A.Yusifova genimodifikasiya olunmuş qidaların insan sağlamlığına zərəri barədə əhəmiyyətli məlumatlar verib.

FHN-nin Baş İdarəsinin Regional mərkəzlərlə işin təşkili, layihələrin idarə edilməsi və təhsil məsələləri üzrə şöbə müdiri Nəcibə Əfəndiyeva genofondun qorunmasının ətraf mühit, regionlar üzrə zərərli maddələrin atqıntıları barədə materialları seminar iştirakçılarının nəzərinə çatdırıb.

"Ömür" Klinikasının direktoru və baş həkimi, tibb üzrə fəlsəfə doktoru G.Məmmədova "Sağlam qadın-sağlam nəsil" mövzusunda çıxış edərək sağlam nəslin yetişməsi problemləri, xüsusi patologiyalara səbəb olan amillər barədə seminar iştirakçılarına məlumat verib, sağlam nəslin yetişməsində qohum nikahlarının zərərini qeyd edib. Faktiki məlumatlar əsasında hazırlanmış çıxış seminar iştirakçıları tərəfindən maraqla qarşılanıb.

Klinikanın Elmi işlər üzrə direktor müavini R.Rzayeva "Sağlam genofondun tibbi və sosial aspektləri" mözvusunda tarixi-tibbi məlumatlar verib.

DTX-nın Qospitalının həkim-terapevti, bitkilər üzrə tədqiqatçı E.Rəhimov seminarda immun sistemin qorunması, sağlam nəslin yetişməsi ətrafında təbiətin yetişdirdiyi mühafizəçilər-şəfalı bitkilər haqqında məlumat verib.



E.Rəhimov sağlamlıq üçün əhəmiyyətli reseptlər verib. Həkimin çıxışı seminar iştirakçıları tərəfindən xüsusi maraqla qarşılanıb.

Seminara dəvət olunmuş qonaqlardan "Kaspi" qəzetinin baş redaktoru İlham Quliyev genimodifikasiya olunmuş qidalara qarşı maarifləndirmə tədbirlərinin böyük əhəmiyyəti olduğunu qeyd edib. Media vasitələrinin bu mövzuya xüsusi diqqət yetirdiyini seminar iştirakçılarının nəzərinə çatdırıb.

ADNSU-nun Cihaz mühəndisliyi kafedrasının müdiri, texnika elmləri doktoru Lalə Bəkirova seminarın çox aktual bir mövzuya həsr olunduğunu, gələcəkdə bu tədbirlərin genişləndirilib bir layihə şəklində işlənməsinin vacib olduğunu qeyd edib.

Biologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent A.Yusifovanın və FHN-nin Baş İdarəsinin Regional mərkəzlərlə işin təşkili, layihələrin idarə edilməsi və təhsil məsələləri üzrə şöbə müdiri N.Əfəndiyevanın çıxışlarının daha geniş auditoriyada təşkil olunmasının vacibliyi nəzərə alınıb.

Sonda dekan, dosent E.Mehbalıyeva seminarın çox aktual bir məsələyə həsr olunduğunu qeyd edərək, bu mövzunun ölkə səviyyəsində layihə formasında hazırlanmasının vacib olduğunu seminar iştirakçılarının nəzərinə çatdırıb.

# ADPU-nun tələbələri adlı təqaüdə layiq görülüblər

2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələrinə görə əla və yaxşı qiymətlərlə oxuyan, həmkarlar ittifaqı fəalı olan ali məktəb tələbələrinə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin(ATİAHİ) adlı təqaüdü təqdim edilib. Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyasında təşkil olunmuş tədbirdə ATİAHİ-nin Respublika Komitəsinin sədri, millət vəkili Səttar Mehbalıyev Azərbaycanda həyata keçirilən dövlət gənclər siyasətindən danışıb.



O, həmkarlar ittifaqı təşkilatları tərəfindən dövlət gənclər siyasətinə verilən dəstəkdən bəhs edərək bu istiqamətdə həyata keçirilən tədbirlər barədə məlumat verib. Qeyd edək ki, tələbələrdə elmə, təhsilə marağın artırılması məqsədilə 1995-ci ildə ATİAHİ-nin Respublika Komitəsinin adlı təqaüdü təsis edilib.

Sonra payız semestrinin imtahan sessiyasının nəticələrinə görə əla və yaxşı qiymətlərlə oxuyan, həmkarlar ittifaqı fəalı olan ali məktəb tələbələrinə ATİAHİ-nin Respublika Komitəsinin adlı təqaüdü təqdim edilib.

Məmnunluq hissi ilə bildiririk ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin(ADPU) tələbələri də təqaüd alanların sırasındadır. Məlumat üçün bildirək ki, adlı təqaüd alan tələbələr arasında Filologiya fakültəsinin tələbəsi Təranə Nəbiyeva, Musiqi,təsviri incəsənət,fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin tələbəsi Əhməd Almuradov, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin tələbəsi Püstəxanım Məmmədzadə, SABAH qruplarının tələbəsi Aytac Qənbərova və ADPU-nun Ağcabədi Filialının tələbəsi Anar Əliyev var.

Biz də tələbələrimizi bu uğur münasibətilə ürəkdən təbrik edir, həyatda, təhsildə və ictimai fəaliyyətlərində yeni-yeni uğurlar arzulayırıq.

**Könül Nərimanqızı**

# "Elm günü" münasibətilə kitab sərgisi

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2018-ci ilin aprel ayının 9-da imzaladığı Sərəncamla mart ayının 27-si ölkəmizdə "Elm günü" kimi qeyd olunur. Bu Sərəncama uyğun olaraq martın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə "Elm günü"nə həsr edilmiş kitab sərgisi keçirilib. Sərgidə Filologiya fakültəsinin professor-müəllim heyətinin əsərləri nümayiş etdirilib. ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, müəllim və tələbələr sərgidə nümayiş etdirilən əsərlərlə tanış olublar. Sərgi ilə tanışlıq onlarda xoş təəssürat yaradıb.



Çıxış edən Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova bildirib ki, dövlət başçımız cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə martın 27-nin "Elm günü" kimi qeyd edilməsi ölkəmizdə elmə, təhsilə verilən böyük dəyərdir. Dövlət müstəqilliyinin 28 il əvvəl bərpa etmiş bir xalqın elmə və elm adamlarına münasibətinin tarixi isə min illərlə ölçülür. XX əsrin əvvəllərində Azərbaycan elminin inkişafında ADPU-nun məxsusi yeri vardır. Nəriman Nərimanov, Mustafa Quliyev, Üzeyir Hacıbəyli, Vəli Xuluflu, Bəkir Çobanzadə, Fətulla bəy Rzabəyli, Həbib bəy Mahmudbəyov və digər onlarla Vətən fədaisinin zəhməti hesabına yaradılan universitetimiz Azərbaycan elminə parlaq şəxsiyyətlər vermişdir. Bu ali məktəbin məzunları olmuş Yusif Məmmədəliyev, Heydər Hüseynov, Zahid Xəlilov, İbrahim İbrahimov, Məmmədcəfər Cəfərov, Əbdüləzəl Dəmirçizadə, Əlövsət Sumbatzadə, Məmmədağa Şirəliyev və digər çoxsaylı məşhur elm adamları dünya miqyasında elmi xidmətləri olan şəxslərə çevrildilər. Onlar Azərbaycan Milli Elmlər Akademiyasının yaranıb formalaşmasında böyük işlər gördülər. Universitetimiz bu gün də adını çəkdiyimiz bu böyük elm və təhsil fədailərinin şərəfli işini uğurla davam etdirir. ADPU-da, o cümlədən onun böyük fakültələrindən biri olan Filologiya fakültəsində çalışan çoxsaylı professor-müəllim heyəti tədris prosesi ilə bərabər, elmi-pedaqoji axtarışlarını da davam etdirir, ölkəmizin və dünyanın aparıcı elmi nəşrlərində həmin elmi işlərin nəticələrini həmkarları ilə bölüşürlər. ADPU-da təhsilin müasirləşməsi və elmi axtarışların səmərəliliyi üçün universitetin rektoru, professor Cəfər Cəfərovun xidmətlərini xüsusi qeyd etmək lazımdır. Bizim universitetimizin böyük ənənələrini yaradıcılıqla davam etdirmək üçün yüksək potensialımız var və həmin potensialı əməli işlərlə ortaya qoymalıyıq.



Sərgidən sonra fakültənin müəllimləri və tələbələri kitabın, mütaliənin təbliği məqsədilə Qız Qalasına doğru yürüş ediblər. Onlar yürüş zamanı şəhər sakinlərinə və əcnəbi qonaqlara kitablar bağışlayıblar.

**Nurlan İftixaroğlu**

# Tarix və coğrafiya fakültəsində Cəfər Cabbarlının 120 illiyi münasibətilə ingilis dilində tədbir

Martın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsində fakültənin dekan müavini, tarix üzrə fəlsəfə doktoru Habil Həsənovun və Filologiya fakültəsinin İngilis dili kafedrasının baş müəllimi Sevda Ağayevanın rəhbərliyi ilə tələbələrin və Bakı şəhəri Nizami rayonu Milli Qəhrəman Məzahir Rüstəmov adına 32 nömrəli tam orta məktəbin 3 c sinif şagirdi Avtandil Əliyevin iştirakı ilə XX əsr Azərbaycan ədəbiyyatının geniş şöhrət tapmış nadir simalarından biri olan Cəfər Cabbarlının 120 illiyi münasibətilə ingilis dilində "I am such an unfading leaf" (Mən bir solmaz yarpağam) adlı tədbir təşkil edilib.



Tədbirdə dramaturgiyamızın təşəkkülü və yüksəlişi tarixində yeni mərhələnin təməlini qoyan Cəfər Cabbarlının əsərləri milli teatrda mühüm hadisə kimi dəyərləndirilib, uzun illər boyu tamaşaçıların bir neçə nəslinin estetik zövqünün formalaşmasında, ədəbi-mədəni proseslərin fəal qurucularından biri olaraq sənətkarın yaratdığı güclü xarakterlər və koloritli obrazlarla bədii-estetik fikir salnaməmizə misilsiz töhfələr verilməsindən bəhs edilib.

Eyni zamanda tələbələr tədbirin davamında ölməz ədibin həyat və yaradıcılığı barədə ətraflı danışaraq sevilən şeirlərini söyləyiblər və Cəfər Cabbarlının əsərlərindən olan mahnılar ifa ediblər.

Daha sonra tələbələr ədibin "Sevil" dramından səhnəciklər göstəriblər. Tələbələrin çıxışları sinxron olaraq videoçarxla müşayiət olunub.

Tədbirin sonunda dekan müavini Habil Həsənov Sevda Ağayevaya və tədbirdə iştirak edən müəllim və tələbə heyətinə öz minnətdarlığını bildirib.

# Pedaqoji təcrübə zamanı dərslərin müşahidəsində diqqət ediləcək məsələlər

Məlum olduğu kimi, tələbələrimiz Bakı şəhəri üzrə ümumtəhsil məktəblərində pedaqoji təcrübə keçirlər.Universitetimizdə pedaqoji təcrübənin başlanmasına qədər rektorluğun və Tədris Departamentinin göstərişi əsasında ADPU-nun Təcrübə Komissiyası bir neçə dəfə yığcam və geniş tərkibdə müşavirələr keçirmiş, tələbələrin pedaqoji təcrübələrinin təşkilinin daha səmərəli olması üçün hüquqi-normativ işləri həll etmiş, onun keçirilməsi üçün ilk dəfə olaraq ”İşçi proqramı”nı təcrübə rəhbərlərinin istifadəsinə təqdim etmiş,təcrübə jurnallarını yeniləmiş, pedaqoji təcrübənin nümunəvi gündəliyini hazırlamış, ”Pedaqoji təcrübənin keçirilməsinə dair ”Yaddaş”ı professor-müəllim heyətinin istifadəsinə təqdim etmişdir.

Rektorluğun və Tədris Departamentinin təşəbbüsü ilə tələbələrin pedaqoji təcrübəyə başlamasından bir gün əvvəl pedaqoji təcrübə rəhbərləri ilə Təcrübə Komissiyasının geniş tərkibli təlimati xarakterli müşavirəsi keçirilmiş, təcrübənin keçirilməsinə dair metodik izahat işləri aparılmış, iştirakçıların sualları çavablandırılımışdır.

Pedaqoji təcrübənin keçirilməsi üçün qəbul olunan qərarların vacibliyini, tətbiqini gözləyən yeniliklərin zəruriliyini, təcrübənin ilkin müəllim hazırlığı işində mühüm, həlledici və yekun mərhələ olduğunu nəzərə alsaq, görülmüş işləri müsbət qəbul etmək olar.

Amma bütün bunlarla yanaşı, təcrübənin gedişi zamanı müşahidə olunan və hazırda izaha ehtiyacı olan bəzi məqamları da qeyd etmək yerinə düşərdi. İlkin müşahidələr onu göstərdi ki, hələ də tələbələrimiz sınaq dərsləri keçərkən nələrə diqqət yetirəcəklərini, təcrübəçi tələbə yoldaşlarının dərslərini dinləyərkən (müşahidə edən zaman) hansı məqamlara öz münasibətlərini bildirəcəklərini kifayət qədər təsəvvür edə bilmirlər.

Bunun əsas səbəbini fənlərin tədrisi metodikası kursunda axtarmaq lazımdır. Etiraf etməliyik ki, həmin kursun praktikyönümlülüyü hələ də lazımi səviyyədə təmin olunmamışdır. Təbiidir ki, növbəti tədris ilində Təcrübə Komissiyası bu boşluğu da doldurmaq üçün gərəkli olan addımları atacaqdır. Biz hələlik tələbələrimizə lazım olan dəstəyi vermək üçün bir nümunə olaraq dərslərin müşahidəsi zamanı diqqət ediləcək məsələləri onların və təcrübə rəhbərlərinin diqqətinə çatdırırıq. Buyurub məzmunu ilə tanış olun. Dərsin gedişi zamanı:

1. Dərsin qarşısında duran vəzifələr - təlim nəticələri (dərsin məqsədi) uğurla həll olundumu?

2. Dərs üçün nəzərdə tutulan: a) texnikalardan(üsullardan); b) iş formalarından; c) resurslardan səmərəli istifadə olundumu?

3. Dərsin gedişində: a) təlim nəticələri; b) qrup tapşırıqları; c) qiymətləndirmə meyarları üst-üstə düşürdümü? Bunlar eyni olmalıdır. Yəni təlim nəticələri qrup tapşırıqlarına, onlar da meyarlara çevrilməlidir. Fərq burasında olacaq ki, təlim nəticəsində feillər indiki zamanda, qrup tapşırıqlarında əmr formasında, qiymətləndirmə meyarlarında isə feili-isim formasında - ma,-mə - kimi göstərilir.

4. Dərsdə təlim nəticələrinin (məqsədin) əldə olunmasına cəlb olunan; a) üsul; b) vasitələri, alətləri yetərli saymaq olarmı?

5. Dərsin gedişi zamanı fəal/interaktiv dərsin mərhələlərinə necə əməl olundu?

a. Motivasiya düzgün quruldumu? Yəni a) mövzu;, b) tədqiqat sualları; c) ilkin fərziyyələrin yazılması düzgün və ardıcıllıqla həyata keçdimi?

b. Tədqiqın aparılması mərhələsi düzgün quruldumu? a)Yəni qruplara tapşırıq verildimi? b) vaxt elan olundumu? c) tapşırığın icrasına nəzarət olundumu? d) qrup tapşırıqları təlim nəticəsinə uyğun idimi?

c. Məlumat mübadiləsi mərhələsində: a) qruplara bərabər vaxt ayrıldımı? b) təqdimatçılara müəllim və sinif lazımınca qulaq asdımı? c) fərqlənən qruplara diqqət yetirildimi? d) onlar qiymətləndirildimi?

ç. Məlumatın müzakirəsi və təşkili mərhələsində: a) müzakirə sualları verildimi? b) onlar təqdimatların məzmununu əhatə etdimi? c) suallar təqdimatlardakı məzmunu ümumiləşdirə bildimi?

d. Nəticələrin çıxarılması mərhələsində: a) ümumiləşdirilmiş məzmunla - yekun qənaətlə ilkin fərziyyələr tutuşduruldumu? b) nələrin yeni, nələrin təsdiq olunduğu müşahidə etdirildimi?

e. Yaradıcı tətbiqetmə mərhələsindəki tapşırıqlar: a) düzgün qoyulmuşdumu? b) vaxt ayrılmışdımı? c) tapşırığın necə icra olunması nəzarətə götürülmüşdümü? d) tapşırıqlar dəyərləndirildimi?

f. Qiymətləndirmə meyarları: a) qrup tapşırığı və b) təlim nəticələri ilə eyni idimi? c) müəllim qiymətləndirməni düzgün apara bildimi?

6. Müəllimin: a) fasilitasiya; b) ünsiyyət; c) idarəetmə; d) stimullaşdırma; e) psixoloji dəstəkləmə bacarıqları necə idi?

7. Dərsin gedişi: a) cəlbedici və b) maraqlı idimi?

8. Dərs: a) pedaqoji; b) psixoloji; c) metodiki və d) elmi baxımdan tələbləri ödədimi?

9. Dərsdə istifadə olunan əyani və texniki vasitələr məqsədəuyğun idimi?

10. Dərs barədə yekun rəyiniz nə oldu?

Əziz tələbələr və müəllim həmkarlarımız. Dərsin gedişi zamanı hər bir bəndin, yarımbəndin qarşısında müsbət (+) və ya mənfi (-) işarəsinin qeyd olunması həm tələbənin vaxtını almır, həm də onun öz dərsinə hazırlaşması işinə lazımi səviyyədə metodik bir yaddaş kimi kömək etmiş olur. Belə hesab edirəm ki, hazırkı sxemi hər iki tərəf yadda saxlasa, həmin sxem əsasında dərsləri izləsə və dəyərləndirsə, ümumi işimizin xeyrinə olardı.

**Fəxrəddin Yusifov,**
**Təcrübə Komissiyasının üzvü, dosent**

# Dövlət Miqrasiya Xidmətinin Şəki Regional Bölməsinin əməkdaşları ilə görüş



Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında Dövlət Miqrasiya Xidmətinin Şəki Regional Bölməsinin təşəbbüsü ilə professor-müəllim heyəti və tələbələrin görüşü keçirilib. Tədbirdə Dövlət Miqrasiya Xidmətinin Şəki Regional bölməsinin şöbə rəisi Taleh Musayev, bölmə rəisləri Faiq Məmmədov, Rəşad Bağırov, inspektorlar Taleh Abdulmənəfov və Elnur Əliyev iştirak ediblər.

Maarifləndirmə xarakterli tədbiri giriş sözü ilə filialın direktoru, dosent Rafiq Rasulov açaraq, tədbirin əhəmiyyətindən bəhs edib. Sonra Şəki Regional Miqrasiya İdarəsinin şöbə rəisi Taleh Musayev ümumi məlumat verib. Qeyd olunub ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 19 mart 2007-ci il tarixli fərmanı ilə Azərbaycan Respublikası Dövlət Miqrasiya Xidməti yaradılıb və onun Əsasnaməsi təsdiq edilib. Hazırda respublikamızda Dövlət Miqrasiya Xidmətinin 8 regional idarəsi fəaliyyət göstərir. Dövlət Miqrasiya Xidməti müasir qloballaşan dünyada miqrasiya proseslərinin idarə edilməsi, təhlili, proqnozlaşdırılması və monitorinqinin təşkil edilməsi, eyni zamanda vahid informasiya sisteminin yaradılması, bu sahədə beynəlxaq əməkdaşlığın inkişaf etdirilməsi, əcnəbi və vətəndaşlığı olmayan şəxslərə müvəqqəti və daimi yaşamaq üçün icazənin, immiqrant statusunun verilməsi və digər mühüm əhəmiyyətli məsələlər üzrə fəaliyyətləri həyata keçirir.

Şəki Regional Miqrasiya İdarəsinin bölmə rəisi Faiq Məmmədovun “Dövlət Miqrasiya Xidmətinin yaradılması və fəaliyyəti” mövzusunda məruzəsi, bölmə rəisi Rəşad Bağırovun “DMX-nin dövlət gənclər siyasətində rolu”, Şəki Regional Miqrasiya İdarəsinin inspektoru Taleh Abdulmənəfovun “Elektron hökumət” portalında DMX üzrə müraciətlərin aparılması qaydaları” mövzusunda çıxışları dinlənilib və tədbir iştirakçılarına “MİGAZ” ın istifadəsi, tətbiqində olan yeniliklər ilə bağlı məlumatlar izahlı videotəlimat vasitəsi ilə əyani göstərilib.

Tədbirdə ölkəmizin Dövlət Miqrasiya Xidməti siyasətinin məqsədi, vəzifələri, milli maraqların qorunması, qanunsuz miqrasiyaya, vətəndaşlığı olmayan şəxslərin ölkədə yaşaması, xaric edilməsi, qeydiyyata alınması və s. məsələlər ətrafında geniş fikir mübadiləsi aparılıb.

Tədbirin sonunda Dövlət Miqrasiya Xidmətinin Şəki Regional Bölməsinin əməkdaşları müəllim və tələbələri maraqlandıran sualları cavablandırıblar. Xatirə şəkilləri çəkdiriblər.

# ADPU-nun Ağcabədi Filialında “Elm günü” münasibətilə elmi-praktik konfrans

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında “Elm günü” münasibətilə “Heydər Əliyevin Azərbaycan elminin inkişafında rolu” mövzusunda elmi-praktik konfrans keçirildi. Konfransda filialın professor-müəllim heyəti və tələbələri iştirak edirdi.



Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.

Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva Azərbaycan elminin inkişaf tarixi, sayılıb-seçilən elm adamları, elmin, təhsilin inkişafına diqqət və qayğısını əsirgəməyən böyük tarixi şəxsiyyətlərdən danışdı. Qeyd etdi ki, Azərbaycan elmi bu gün yüksək nailiyyətlər qazanır və təbii ki, bu nailiyyətlərin əldə olunması ulu öndərimiz Heydər Əliyevin adı ilə bağlıdır. İstər Azərbaycana rəhbərliyinin birinci dövründə, istərsə də son dövrlərdə Azərbaycan elminin inkişafı Ulu Öndərimizin strateji fəaliyyət planının əsasını təşkil etmişdir.

Konfransın gündəliyi elan olunmazdan əvvəl Azərbaycan elminin inkişafı ilə əlaqədar Ulu Öndərimizin çıxışlarının müəyyən bir hissəsini əhatə edən videolent nümayiş etdirildi.

Sonra dosent M.Fərzəliyeva konfrans iştirakçılarını gündəliklə tanış etdi və ilk məruzə üçün sözü filialın Xüsusi və ümumelmi fənlər kafedrasının müdiri, dosent əvəzi Tahir Kərimliyə verdi. “Heydər Əliyev və Azərbaycan elmi” mövzusunda məruzə edən Tahir Kərimli Azərbaycan elminin dünəni, bu günü və gələcəyi ilə bağlı ətraflı danışdı. Xalqımız müstəqillik əldə etdikdən sonra Azərbaycan elminin inkişafı sahəsində əldə edilmiş nailiyyətləri fərəh hissi ilə qeyd etdi. Məruzəçi Azərbaycan elminin qayğısını çəkən ümummilli liderimiz Heydər Əliyevin “Təhsil millətin gələcəyidir” deyiminin mahiyyətini açıqladı.

Növbəti məruzə üçün söz filialın Tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanova verildi. “Heydər Əliyevin milli təhsilimizin inkişafında rolu” mövzusunda məruzə edən S.Süleymanov bildirdi ki, Ulu Öndərimiz ölkənin və xalqın taleyində, hərtərəfli tərəqqi etməsində təhsilin rolunu vacib bilmiş, yüksək dəyərləndirmişdir.

Məruzəçi qüdrətli lider Heydər Əliyevin həm təhsilin məzmunu, mahiyyəti, məqsədləri, səmərəli təşkili, həm də Azərbaycan təhsilinin hərtərəfli yüksəlişi sahəsində atdığı məqsədyönlü addımlar, Azərbaycan təhsilinin dünya təhsil sisteminə inteqrasiyası kimi məsələlərdən danışdı.

Sonuncu məruzə üçün söz Dillər, ədəbiyyat və onların tədrisi metodikası kafedrasının müdiri, dosent Vaqif Allahverdiyevə verildi. “Müstəqillik dövründə Azərbaycan ədəbiyyatının inkişafı” mövzusunda məruzə edən dosent V.Allahverdiyev həmin illərdə yaranmış ədəbiyyat nümunələrindən, dövrün yetişdirdiyi sənətkarların həyat və bədii fəaliyyətindən danışdı. Məlum oldu ki, müstəqillik illərində yaradılmış ədəbiyyatımızın böyük əksəriyyəti öz mayasını, rişəsini xalqımızın qanı bahasına əldə etdiyi suverenlik, azadlıq və istiqlaliyyət duyğusundan almışdır.

Dosent V. Allahverdiyev “Elm günü” münasibətilə konfrans iştirakçılarını təbrik etdi və vurğuladı ki, Azərbaycan elmi öz tarixi inkişafı üçün ümummilli liderimiz Heydər Əliyevə borcludur. Biz bütün əməli fəaliyyətimizlə Ulu Öndərimizin bizə miras qoyduğu ənənələrə sahib çıxmalı, onun ideyalarına sədaqətlə xidmət etməliyik.

# ADPU-nun Şamaxı Filialında birgə əməkdaşlıq haqqında memorandum imzalandı




Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialı ilə Mədəniyyət Nazirliyinin Mədəniyyət üzrə Elmi-Metodiki və İxtisasartırma Mərkəzi arasında birgə əməkdaşlıq haqqında anlaşma memorandumu imzalandı. Bu münasibətlə martın 5-də filialın Heydər Əliyev lektoriyasında tədbir keçirildi.

Tədbirdən öncə filialın və mərkəzin rəhbərliyi Şamaxı şəhərinin mərkəzində yerləşən ulu öndər Heydər Əliyevin abidəsini ziyarət edərək abidənin önünə tər çiçəklər düzdülər və Ulu Öndərə ehtiramlarını ifadə etdilər.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlandı.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Tünzalə Yusifova tədbir iştirakçılarını salamlayaraq bu əlamətdar gün münasibətilə hər kəsi təbrik etdi. Filialın yaranma tarixindən və nailiyyətlərindən danışan direktor filialda keyfiyyətli tədris prosesinin qurulması ilə yanaşı, elmi-mədəni-kütləvi tədbirlərin keçirilməsinə də xüsusi diqqət ayrıldığını vurğuladı. İmzalanacaq memorandumun filial tarixində bir ilk olduğunu qeyd edən T.Yusifova hər iki tərəfə uğurlar arzuladı.

Çıxışlardan öncə ADPU-nun Şamaxı Filialının direktoru ilə Mədəniyyət Nazirliyinin Mədəniyyət üzrə Elmi-Metodiki və İxtisasartırma Mərkəzi arasında təntənəli şəkildə memorandum imzalandı.

Mərkəzin elmi katibi Cavid Əliyev mərkəz tərəfindən müxtəlif təşkilatlarla respublika və beynəlxalq səviyyəli müqavilələrin imzalanması barədə təqdimatla çıxış etdi.

Mərkəzin direktoru, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Usubəliyev bu tədbirin məhz Şamaxı şəhərində və filialda keçirilməsinin əhəmiyyətindən danışaraq, bu əməkdaşlığın ölkədə gözəl ənənə yaradacığını da vurğuladı. O, Şamaxı Filialı ilə Mərkəz arasında həyata keçiriləcək əməkdaşlıq çərçivəsində mədəniyyət müəssisələrinin əməkdaşlarının hazırlıq səviyyəsinin artırılmasına, milli mədəniyyətin tanıdılmasına və təbliğinə xidmət edəcək birgə tədris və təlim proqramlarının həyata keçiriləcəyini iştirakçıların diqqətinə çatdırdı.

Sonra çıxış edən Mərkəzin Elmi təminat və araşdırmalar şöbəsinin müdiri Sənan Talıbov müxtəlif təşkilatlarla imzalanan müqavilələrdən irəli gələrək həyata keçirilən tədbirlərdən danışdı. S.Talıbov regionda müasir standartlara cavab verən belə bir ali təhsil müəssisəsinin mövcudluğundan qürur hissi duyduğunu qeyd etdi.

İctimai elmlər və xüsusi fənlər kafedrasının dosenti Mayıl Alıcanov memorandumun imzalanması münasibətilə filialın və Mərkəzin əməkdaşlarını təbrik edərək onlara gələcək fəaliyyətlərində uğurlar arzuladı.

# Allah rəhmət etsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Biologiya və onun tədrisi metodikası kafedrasının dosenti Alı Namazova həyat yoldaşı

**Şəfəq xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekan müavini, dosent Allahyar İmanova qardaşı

**Ələmdar İmanovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının baş müəllimi Zenfira Qədirovaya oğlu

**Azərin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

**Redaktor:** Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1062
Sayı: 1500
Çapa imzalanıb: 29.03.2019-cu il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, “Azərbaycan” Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.